QƏZET 01.02.1958-ci
İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

**BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!**
*Məhəmməd Peyğəmbər (S.)*

İyun
2014
06 (1060)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## Azərbaycan Respublikasının ərazi bütövlüyünün, müstəqilliyinin və konstitusiya quruluşunun müdafiəsi ilə əlaqədar əlil olmuş şəxslərin və şəhid ailələrinin sosial-məişət şəraitinin yaxşılaşdırılmasına dair əlavə tədbirlər haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

Azərbaycan Respublikasının ərazi bütövlüyünün, müstəqilliyinin və konstitusiya quruluşunun müdafiəsi ilə əlaqədar əlil olmuş şəxslərin və şəhid ailələrinin sosial müdafiəsinin gücləndirilməsi daim diqqət mərkəzində olan məsələlərdəndir. 2014-cü ilədək bu kateqoriyadan olan 4278 əlil və şəhid ailəsi mənzillə təmin edilmiş, 5731 nəfər yerli icra hakimiyyəti orqanlarında yaşayış sahəsinə ehtiyacı olan qismində uçota alınmışdır.

Azərbaycan Respublikasının ərazi bütövlüyünün, müstəqilliyinin və konstitusiya quruluşunun müdafiəsi ilə əlaqədar əlil olmuş şəxslərin və şəhid ailələrinin sosial-məişət şəraitini yaxşılaşdırmaq məqsədi ilə Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

1. Azərbaycan Respublikasının Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi 2014-cü il yanvarın 1-dək yerli icra hakimiyyəti orqanlarında yaşayış sahəsinə ehtiyacı olan qismində uçota alınmış Azərbaycan Respublikasının ərazi bütövlüyünün, müstəqilliyinin və konstitusiya quruluşunun müdafiəsi ilə əlaqədar əlil olmuş şəxslərin və şəhid ailələrinin 2014-2018-ci illər ərzində mərhələlərlə mənzil və ya fərdi evlə təmin edilməsi üçün tədbirlər planı hazırlayıb Azərbaycan Respublikasının Prezidenti ilə razılaşdırmaqla həyata keçirsin.

2. Yerli icra hakimiyyəti orqanları Azərbaycan Respublikasının Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin müraciəti əsasında bu sərəncamın 1-ci hissəsində göstərilən məqsədlər üçün torpaq sahələrinin ayrılmasını təmin etsin və bu barədə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin.

3. Azərbaycan Respublikasının Nazirlər Kabineti:

3.1. bu sərəncamın 1-ci hissəsində göstərilən tədbirləri həyata keçirmək üçün tələb olunan ilkin vəsaitin Azərbaycan Respublikasının 2014-cü il dövlət büdcəsindən ayrılmasını, 2015-2018-ci illərdə isə hər il dövlət büdcəsinin tərtibi prosesində zəruri vəsaitin dövlətin əsaslı vəsait qoyuluşunda nəzərdə tutulmasını təmin etsin;

3.2. bu sərəncamın icrası ilə bağlı görülmüş işlər barədə hər növbəti ilin birinci ayında Azərbaycan Respublikasının Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin hesabatı əsasında Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

3.3. bu sərəncamdan irəli gələn digər məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 20 iyun 2014-cü il*

### *15 İyun - Milli Qurtuluş Günüdür!*

# ADPU-da 15 İyun - Milli Qurtuluş Gününə həsr edilmiş tədbir keçirilib

Bu günlər respublikamızda 15 İyun - Milli Qurtuluş Günü münasibətilə müxtəlif tədbirlər keçirilir. Bu tədbirlərdə 1993-cü il 15 iyununun xalqımızın tarixində böyük siyasi əhəmiyyət kəsb etdiyi xüsusi vurğulanır. Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) "Heydər Əliyev məktəbinin lektoriyası"nda iyun ayının 13-də 15 İyun - Milli Qurtuluş Gününə həsr edilmiş tədbirdə də bu barədə maraqlı və dəyərli çıxışlar edilmişdir.

ADPU-da 15 İyun - Milli Qurtuluş Gününə həsr edilmiş tədbir ulu öndər Heydər Əliyevin xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlandı. Toplantını ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov giriş sözü ilə açaraq bildirmişdir ki, xalqımızın tarixinə Milli Qurtuluş Günü kimi daxil olmuş 1993-cü ilin 15 iyunundan 21 il keçir. Yaxın tarixi keçmişimizə nəzər saldıqda 1993-cü ilin 15 iyununun sözün həqiqi mənasında xalqımızın həyatına böyük bir tarixi-siyasi hadisə kimi daxil olduğunu görürük. Bizim bugünkü toplantımız da bu əlamətdar tarixi günə həsr edilib. Məhz bu gün xalqımız öz dahi oğlu, milli xilaskarımız, ulu öndərimiz, ümummilli liderimiz Heydər Əliyevin böyük vətənpərvərliyi, zəngin həyat və siyasi təcrübəsi, müdrikliyi, qətiyyəti, uzaqgörənliyi, gərgin səyləri və fədakarlığı nəticəsində vətəndaş müharibəsi təhlükəsindən xilas olmuş, sabitlik və tərəqqi yoluna çıxmış, ölkəmizdə əsl hüquqi, demokratik, dünyəvi dövlət quruculuğunun bünövrəsi qoyulmuşdur.

Rektor Y.Məmmədov yaxın tariximizə istinad edərək qeyd etdi ki, XX əsrin son 50 ilində bəşəriyyət tarixdə misli görünməmiş siyasi dəyişikliklərin şahidi oldu. Ötən əsrin sonlarında dünyada gedən qlobal ictimai-siyasi proseslər Azərbaycan xalqının həyatına da böyük təsir göstərdi. Belə ki, keçmiş SSRİ-nin süqutu prosesinin sürətlənməsi və xalqımızın Dağlıq Qarabağ münaqişəsinin dalğaları üzərində başlayan milli-azadlıq mübarizəsi müstəqil milli dövlətimizin qurulması ilə nəticələndi. Xalqımız, millətimiz ötən yüzilliyin sonlarında öz çoxəsrlik arzusuna qovuşaraq yenidən milli dövlətçiliyini bərpa etdi. 1991-ci il oktyabr ayının 18-də Ali Sovetdə "Azərbaycan Respublikasının dövlət müstəqilliyi haqqında Konstitusiya Aktı" qəbul edildi. Lakin 1991-1993-cü illərdə Azərbaycanın müstəqilliyi formal xarakter daşıyırdı. Əslində, 1991-1993-cü illər Azərbaycanın müstəqilliyinin ən ağır, ən çətin illəri olmuşdur. Çünki həmin dövrdə xalqımız böyük müsibətlər və faciələr hesabına qazandığı dövlət müstəqilliyini tamamilə itirmək təhlükəsi ilə üzləşmişdi. Xalqımızın müstəqil milli dövlət qurmaq arzusuna həm daxili, həm də beynəlxalq siyasi vəziyyət ciddi mənfi təsir göstərirdi. Daxili vəziyyəti ağırlaşdıran əsas səbəb həmin dövrdə respublikamızda siyasi cəhətdən səriştəsiz, idarəçilik və dövlətçilik sahəsində heç bir təcrübəsi olmayan şəxslərin hakimiyyətdə təmsil olunmaları idi. Həmin dövrdə dövlət idarəçiliyində mərkəzdənqaçma meyilləri çox güclü idi. Faktiki olaraq hakimiyyət yalnız bir qrup vəzifəli şəxsin maraqlarına xidmət edirdi. Eyni zamanda həmin tarixi-siyasi şəraitdə Azərbaycanın rəhbərliyində təmsil olunan bəzi şəxslərin xalqımızın milli maraqlarına zidd mövqe tutmaları, bəzi hallarda isə hətta bu maraqlara xəyanət etmələri də respublikamızda müstəqil dövlət quruculuğuna böyük çətinliklər törədirdi. Ordunun siyasiləşdirilməsi də daxili vəziyyəti ağırlaşdıran amillərdən biri idi. Beynəlxalq siyasi vəziyyətə gəldikdə isə, bir faktı xüsusi qeyd etmək yerinə düşər ki, dünyanın bəzi aparıcı dövlətləri bütün mümkün vasitələrlə Azərbaycanın müstəqilliyini elə beşiyindəcə boğmaq istəyirdilər. AXC-Müsavat iqtidarı, əvvəlki iqtidar kimi səriştəsiz xarici siyasəti ilə Azərbaycanın beynəlxalq mövqelərini daha da zəiflədirdi. Hakimiyyətdə olan AXC-Müsavat cütlüyünün birtərəfli xarici siyasət yeritməsi bəzi qonşu dövlətlərin, eləcə də dünyanın siyasi güc mərkəzlərinin Azərbaycana mənfi münasibət bəsləmələrinə səbəb olurdu. Həmin vaxtlar Azərbaycanın rəhbərliyində təmsil olunan şəxslərin mövcud geosiyasi məkanı və müasir dünyanın reallıqlarını nəzərə almadan tez-tez məsuliyyətsiz siyasi bəyanatlar vermələri də ölkəmizin vəziyyətini çətinləşdirir, qonşu dövlətlərlə münasibətləri daha da kəskinləşdirirdi. Bəzi xarici dövlətlər də bundan istifadə edərək Azərbaycanın müstəqilliyinə son qoymaq üçün müəyyən daxili qüvvələrin əli ilə ölkə daxilində hərc-mərclik salır, çaxnaşmalar yaradırdılar. Elə 1993-cü il iyunun 4-də Azərbaycanın ikinci böyük şəhəri olan Gəncədə baş verən məlum hadisələr də bu yuxarıda qeyd etdiklərimizdən irəli gəlirdi. Belə ki, 1993-cü il iyunun 4-də səhər hərbi qiyamı yatırmaq üçün hökumət Gəncəyə 3 minədək canlı qüvvə və güclü hərbi texnika yeritdi. 709 saylı hərbi hissənin kazarmaları dağıdıldı, hərbi təyyarələr havaya qalxıb hava limanını darmadağın etdi. Hərbi qarşıdurma nəticəsində 35 nəfər həlak oldu, 135 nəfər yaralandı, 1200 döyüşçü, habelə respublika prokuroru girov götürüldü. Gəncə şəhərinə böyük ziyan dəydi. Hərbi qarşıdurma nəticəsində həlak olanlar arasında dinc mülki əhali, qocalar və uşaqlar da var idi. Hökumət qüvvələri məğlub edildi və qiyamçı hərbi hissələr Bakıya doğru hərəkət etməyə başladılar. Yaranmış böhranlı siyasi vəziyyətlə əlaqədar parlamentin sədri, baş nazir, üç güc nazirliyinin rəhbərləri istefaya getməyə məcbur oldular.



Gəncədə baş vermiş bu qanlı hadisə dövlətin bütün strukturlarını iflic vəziyyətinə salmışdı. Baş vermiş bu faciəli hadisə respublikamızın bütün bölgələrinə mənfi təsir göstərmişdi. Ölkədə xaos, anarxiya hökm sürürdü, ikihakimiyyətlilik yaranmışdı. Hakimiyyətin yerlərdəki nümayəndələri bir-birinin ardınca dövlətə tabe olmayan qüvvələrin tərəfinə keçirdilər. Yaxın tarixi keçmişimizin ən ağrılı və faciəli səhifələrindən biri olan 4 iyun hadisələri nəticəsində Azərbaycanda sözün həqiqi mənasında vətəndaş müharibəsi təhlükəsi yaranmışdı. Əslində, Azərbaycan hələ çox kövrək olan müstəqilliyini yenidən itirmək təhlükəsi ilə qarşılaşmışdı. Həmin dövrün hakimiyyəti isə ölkədə yaranmış siyasi-hərbi böhranı aradan qaldırmağa qadir deyildi. Buna onların gücü, iradəsi və səriştəsi çatmırdı. Onların gücü yalnız əlacsız qalaraq bir-birinin ardınca tutduqları vəzifələrdən istefa verməyə çatırdı. Nəhayət, ölkədəki anarxiyadan və dağıdıcı ictimai-siyasi proseslərdən cana doymuş xalq yenidən öz böyük oğlu, görkəmli siyasi xadim, ümummilli liderimiz Heydər Əliyevə üz tutdu. Xalqının, millətinin, Vətəninin düşdüyü faciəyə dözə bilməyən ulu öndərimiz Heydər Əliyev xalqın inadlı təkidi və çox böyük istəyi ilə iyun ayının 9-da Bakıya gəldi. Bütün Azərbaycan xalqı bu gəlişi böyük ümid və sevinclə qarşıladı. Xalqımızın böyük oğlu Heydər Əliyev iyunun 15-də mütləq səs çoxluğu ilə Ali Sovetə sədr seçildi. Həmin il iyun ayının 23-də Milli Məclis yaranmış vəziyyətlə əlaqədar prezident səlahiyyətlərinin Ali Sovetin sədri Heydər Əliyevə verilməsi barədə qərar qəbul etdi. Xalq öz rəhbəri Heydər Əliyevin ətrafında daha sıx birləşməyə başladı. 1993-cü il oktyabrın 3-də isə xalqımız ulu öndər Heydər Əliyevi alternativ əsasda böyük səs çoxluğu ilə Azərbaycan Respublikasının Prezidenti seçdi. Bu seçkilər bütün Azərbaycan xalqının Heydər Əliyevə böyük ümidlər bəslədiyini bir daha nümayiş etdirdi.

Xalqımızın vətənpərvər oğlu Heydər Əliyev həyatına böyük təhlükələr yaranmasına baxmayaraq, bir-biri ilə düşmənçilik edən və döyüşən qüvvələr arasında sülh yaratmaq üçün Gəncəyə getdi, vuruşan tərəflər arasında danışıqlar apardı və yenidən qan tökülməsinin qarşısını aldı. Qüdrətli siyasi xadim Heydər Əliyev Azərbaycanda vətəndaş müharibəsini dayandırmaq üçün siyasi manevr-

**(Davamı 2-ci səhifədə)**

# ADPU-da 15 İyun - Milli Qurtuluş Gününə həsr edilmiş tədbir keçirilib

(Əvvəli 1-ci səhifədə)

lər etdi və Gəncədə danışıqlar aparmaqla hərbi müxalifəti neytrallaşdırdı. Məhz ulu öndərimiz Heydər Əliyevin siyasi uzaqgörənliyi, böyük dövlətçilik təcrübəsi sayəsində Azərbaycan vətəndaş müharibəsi təhlükəsindən xilas oldu. Bunun ardınca isə cənubdan, şimaldan baş qaldıran separatçılıq meyillərinin qarşısı qətiyyətlə alındı. Azərbaycan üçün daha böyük faciələrə hesablanmış planların qarşısına keçilməz bir sədd çəkildi. Xalqımızın dahi lideri Heydər Əliyev Azərbaycanı bölgələrə, əyalətlərə parçalanmaq və bütövlükdə yox olmaq təhlükəsindən xilas etdi. Bir sözlə, ulu öndərimiz Heydər Əliyev öz üzərinə düşən xilaskarlıq və quruculuq missiyasının öhdəsindən layiqincə gəldi. Həqiqətən də, 15 İyun xalqımızın Milli Qurtuluş Günü oldu. Tarix baxımından 21 il elə də böyük müddət deyil. Amma bu müddət ərzində müstəqil Azərbaycanda həyatımızın bütün sahələrində böyük uğurlar, nailiyyətlər qazanılmışdır. Bütün bu qazanılmış böyük uğur və nailiyyətlərin hamısı isə dahi şəxsiyyət Heydər Əliyevin müdrik siyasi kursunun nəticəsidir.

Rektor Y.Məmmədov çıxışında bir məqamı xüsusi qeyd etdi: "15 İyun - Milli Qurtuluş Günü Milli Məclisin qərarı ilə 1997-ci il iyunun 27-də rəsmiləşdirildi. Həmin vaxtdan xalqımız 15 İyunu əlamətdar bir tarixi gün kimi qeyd edir və bu günü müstəqil Azərbaycan dövlətinin qurtuluşunun başlanğıcı kimi qiymətləndirir. Bütün bunlarla yanaşı, 15 İyun xalqımızın qurtuluş mübarizəsinin təntənəsi və qələbə çaldığı bir gündür. Tam əminliklə deyə bilərik ki, 1993-cü ilin 15 iyunu, həqiqətən, xalqımızın tarixinə fəlakət və xaosdan Qurtuluş Günü kimi daxil olmuşdur. Bu gün həm də müasir tariximizə müstəqil respublikamızın hərtərəfli tərəqqisinin, hüquqi, demokratik və dünyəvi dövlət quruculuğu prosesinin bünövrəsinin qoyulduğu bir gün kimi də daxil olmuşdur. Hazırda həmin hərtərəfli tərəqqi, inkişaf yeni məzmun və keyfiyyətdə Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev tərəfindən böyük inam və uğurla davam etdirilir. Azərbaycanın hər bir vətəndaşı bu hərtərəfli tərəqqi və inkişafı görür, duyur, ondan faydalanır və bunu çox yüksək qiymətləndirir.

Yekun olaraq bir daha demək istəyirəm ki, 15 İyun - Milli Qurtuluş Günü müstəqil xalqımızın həyatında çox böyük tarixi-siyasi əhəmiyyət kəsb edən bir gündür və xalqımız bu günü hər zaman əziz bayram kimi qeyd edəcəkdir. Sizi bir daha bu əlamətdar tarixi gün münasibətilə təbrik edir, yeni-yeni uğurlar arzulayıram".

Tədbirdə Tarix fakültəsinin dekan müavini, tarix üzrə fəlsəfə doktoru, dosent Nazir Əsədov "15 İyun - Milli Qurtuluş Günü" mövzusunda məruzə ilə çıxış etmişdir. Tədbirdə həmçinin Ümumi tarix kafedrasının müdiri, AMEA-nın müxbir üzvü, professor Vəli Əliyev çıxış etmişdir. Çıxışçılar ulu öndər Heydər Əliyevin xalqımız və dövlətimiz qarşısında göstərdiyi böyük tarixi xidmətlərdən danışmış, Ümummilli Liderin hərtərfli inkişaf strategiyasını Azərbaycan Prezidenti cənab İlham Əliyevin inam və uğurla davam etdirdiyini xüsusi vurğulamışlar.



Tədbirdə ADPU-nun dosenti, Əməkdar müəllim, şair Oqtay Rza ulu öndər Heydər Əliyevə həsr etdiyi şeirini oxumuşdur.

**Mənsur İBRAHİMLİ**

# Elmi Şuranın iclasında



Elmi Şuranın iyun ayının 12-də keçirilən iclasının gündəliyində əsasən iki məsələ durурdu: "Yeni təhsil proqramına keçidin konseptual əsasları" (məruzəçi Fizika fakültəsinin dekanı, professor Mirzəli Murquzov) və "Tələbələrin zəruri ədəbiyyatla təmin edilməsi sahəsində universitetin baza kitabxanasının qarşısında duran vəzifələr haqqında" (məruzəçi universitet kitabxanasının direktoru Azər Hüseynov).

İclası giriş sözü ilə ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, Elmi Şuranın sədri, professor Yusif Məmmədov açdı. Azərbaycanın yeni tarixinə Milli Qurtuluş Günü kimi daxil olmuş 15 İyunun xalqımızın tarixində oynadığı mühüm roldan, ümummilli lider Heydər Əliyevin Azərbaycana yenidən hakimiyyətə qayıtması ilə respublikanın həyatında baş vermiş mühüm dəyişikliklərdən bəhs etdi, bu əlamətdar tarixi gün münasibətilə Elmi Şura üzvlərini təbrik etdi.

Son illər ölkəmizdə təhsil sahəsində uğurlu islahatlar aparılır. Bu ciddi islahatlara səbəb nədir? Bu ehtiyac hardan və nədən yaranmışdır? "Yeni təhsil proqramına keçidin konseptual əsasları" mövzusunda məruzə edən professor M.Murquzov öz dərin məzmunlu çıxışında bu sualları cavablandırdı. ""Onu da bildirim ki, - dedi, - XX əsrin axırlarına doğru getdikcə, elmdə qlobal böhranlar baş vermişdi: inteqrasiya unudulmuşdu, diferensasiya daha sürətlə gedirdi. Diferensasiyanın sürətlə getməsi isə elmin inkişafını tormozlayan amillərdəndir. Buna elmdə "öz-özünə tormozlanma" deyirlər".

İngilis yazıçısı və fiziki Sno 1929-cu ildə bu mövzudan bəhs edən"İki mədəniyyət" adlı əsər yazmışdır. Kitab kütləvi tirajla dünya dillərinə tərcümə olunub yayıldı. Sno bu əsəri ilə göstərdi ki, elmdə inteqrasiya unudulmuşdur, diferensasiya isə o qədər sürətlə gedir ki, fizika, riyaziyyat, ədəbiyyat, tarix və digər ixtisaslar üzrə o qədər yeni və dərin sahələr yaranır ki, hətta eyni ixtisas sahibləri də bir-birləri ilə söhbət zamanı eyni məsələdən bəhs etdikləri halda bir-birlərini başa düşməkdə çətinlik çəkirlər. Snonun elm aləminə təqdim etdiyi "İki mədəniyyət" adlı əsəri dünya alimlərinin, mütəxəssislərin bu sahədə gözünü açdı. Məlum oldu ki, diferensasiya ilə inteqrasiyanı uzlaşdırmaq lazımdır. Bunlar bir-birini inkar edən yox, bir-birini təsdiq edən amillərdir.

Elmin inkişafının əngəllənməsinə səbəb olan amillərdən biri bu idi.

Elmin inkişafına mane olan amillərdən biri də bu idi ki, uzun müddət elmdə nəzəriyyə də, təcrübə də var idi. Ancaq bir çox hallarda, xüsusilə təbiət elmlərində (biologiyada, fizikada) nəzəriyyə təcrübədə təsdiq olunmurdu.

Digər tərəfdən, XX əsrin axırlarına doğru getdikcə elmdə hər cür biliklər toplusundan istifadə olunurdu. Hər cür bilik isə elmi bilik ola bilməz. O bilik elmi bilikdir ki, o, hadisələri, prosesləri, obyektləri inkişafa, bütövlüyə, tamamlamağa və keyfiyyətə doğru aparır. O dövrdə hadisələr ən çox kəmiyyət artımına gedirdi. Halbuki, kəmiyyət keyfiyyətə keçirilməlidir. Vacib məsələlərdən biri də bu idi.

Təkcə XX əsrdə dünya sənayesi bir neçə dəfə yox, 50 dəfə artmışdı. Bu hal özlüyündə təbii olaraq böhran yaratmışdı. Fikrimizi başqa cür ifadə etsək, sənayenin inkişafı dövlətin qüdrətlənməsinə, əhalinin həyat səviyyəsinin yüksəlməsinə səbəb olmuşdusa, digər tərəfdən təbiət "xəstələnmişdi", korlanmışdı, ekologiya hücuma məruz qalmışdı. Belə ki, bir zamanlar insanlar təbiətdən qorxurdusa, elə bir vəziyyət yaranmışdı ki, indi təbiət insanlardan "qorxmağa, çəkinməyə" başlamışdı. Təbiət o qədər çirklənməyə məruz qalmışdı ki, özünütəmizləmə, özünütənzimləmə qabiliyyəti itməyə başlamışdı. Bu isə bəşəriyyət üçün təhlükənin meydana gəlməsi deməkdir. Bütün bunların hamısı özlüyündə qlobal problemlərdir.

İnsanların ehtiyacının ödənilməsi insanların artımından geri qalırdı. Belə ki, həmin dövrün elmi hesablamalarına görə, 2020-ci ildə dünya əhalisinin sayının 8 milyarda çatacağı gözlənilir. Təbiət isə bu qədər insanın tələbatını ödəməkdə gücsüz idi.

Mövcud qlobal problemlərlə yanaşı, XX əsrdə elmdə böyük kəşflər, güclü inkişaf baş vermişdir. Bir tərəfdən hadisələrə baxış düzgün deyildi, digər tərəfdən elmdə güclü inkişaf gedirdi, yeni kəşflər baş verirdi. Bu, XXI əsrin əvvəllərində bəşər tarixində IV Elmi İnqilaba gətirib çıxardı. Bu Elmi İnqilaba qədər kainata qapalı sistem kimi baxılırdı. Məlum oldu ki, qapalı sistem kimi baxanda bütün hadisələri alt-üst edirik, bu, elmi yanaşma deyil. Elmi İnqilab göstərdi ki, hər cür biliyə elmi bilik demək olmaz. Elmi bilik o bilikdir ki, hadisələri tamlığa və bütövlüyə aparsın, yeni keyfiyyət yaratsın.

Ümumiyyətlə, bütün elmlərin fəlsəfəsini, metodologiyasını fizika



müəyyən edir. Fundamental elm olan fizika XX əsrdə dünyanın mənzərəsini tam əks etdirə bilməmişdi, bütövləşməmişdi. Ona görə də Elmdə IV İnqilabdan, başqa sözlə, dünyaya açıq sistem kimi baxandan sonra yeni bir dünyagörüşü formalaşdı. Beləliklə, elmdə əsaslı şəkildə dəyişiklik əmələ gəldi.

IV Elmi İnqilab nəticəsində elmə məlum oldu ki, təbiətdəki bütün sistemlər mürəkkəbdir, açıq, tarazsız olan, nizamsız-xaotik sistemdir, dönməyən, dinamik olmayan, davamsız və qeyri-fərqli sistemdir. İnqilabın nəticəsi olaraq, dərketmənin 3 yeni strategiyası yaradıldı. Hansılardır bu strategiyalar? I - Sistemlik yaranmazsa, inkişaf baş verə bilməz; II - özünütəşkil, III - qlobal təkamül. Dərketmənin strategiyası müəyyənləşəndən sonra dünyanın fiziki mənzərəsi tamam dəyişdi. Məlum oldu ki, 8 fundamental nəzəryyə dünyanın fiziki mənzərəsinin bütün xassələrini, keyfiyyətlərini izah etməyə qadirdir. Bundan sonra dünyanın ümumi mənzərəsi yarandı. Bu zaman təbiət elmləri ilə humanitar elmlər birləşdi, dualizm yarandı. Məlum oldu ki, maddi olmasa, mənəvi mümkün deyildir.

Tədrisin əsasında bunlar durmalıdır.

Mirzəli müəllim nəticə olaraq məruzəsinin sonunda təkliflərlə çıxış etdi.

1. Humanitar sahənin mütəxəssisləri təbiət elmlərinin konsepsiyalarının əsasları ilə tanış olmalıdır (tədris).

2. Fiziklər tarazlıq termodinamikasından qeyri-tarazlıqlı sistemlər termodinamikasına keçməlidir.

3. Riyaziyyatçılar bütün təbiət və humanitar elm sahələrində çoxluqlar nəzəriyyəsinə, sistemlik nəzəriyyəsinə və qeyri-xətti riyaziyyata xüsusi yer verməlidirlər.

4. Fizika fakültəsində postqeyriklassik fizika əsaslı şəkildə tədris olunmalıdır. Klassik dərsliklərdən yenilərinə keçilməlidir.

5. Təbiətşünaslığın konsepsiyaları bütün təbiət və humanitar elm sahələrində tədris olunmalıdır.

6. Bütün metodika kafedralarında yeni aktiv metodların tədqiqinə keçilməlidir (layihələr, dissertasiyalar, tələbə elmi cəmiyyəti və s. yeni aktiv metodlara, onun metodologiyasına keçməlidir).

***

İkinci məsələ - "Tələbələrin zəruri ədəbiyyatla təmin edilməsi sahəsində universitetin baza kitabxanasının qarşısında duran vəzifələr haqqında" ADPU kitabxanasının müdiri Azər Hüseynov məlumat verdi. Ulu öndər Heydər Əliyevin anadan olmasının 90 illiyi ilə əlaqədar Mədəniyyət və Turizm Nazirliyinin təşkil etdiyi III Beynəlxalq Kitab Sərgisində universitetimizin də iştirak etdiyi, ADPU üçün ayrılmış xüsusi paviyonda universitet kitabxanasının fondundan olan 250-dən artıq dərslik və dərs vəsaitinin nümayiş etdirildiyi sərgidə fəal iştirakına görə universitetimizin diploma mükafatlandırıldığı barədə Elmi Şura üzvlərini məlumatlandırdı.

Məruzəçi A.Hüseynovun çıxışından məlum oldu ki, universitetin kitabxanasında mütəmadi olaraq əlamətdar və tarixi günlərlə bağlı, eləcə də müxtəlif mövzulara həsr olunmuş tədbirlər keçirilir. İşçilər arasında kitabxanaya yeni daxil olmuş ədəbiyyatın xülasəsi ilə əlaqədar yığıncaq keçirilir ki, bu da kitabxana əməkdaşlarının yeni ədəbiyyatla tanış olmalarına imkan yaradır. Biblioqrafiya şöbəsinin əməkdaşları "Gənc müəllim" qəzeti səhifələrində vaxtaşırı çıxış etməklə tələbə və müəllimləri universitet kitabxanasına daxil olmuş yeni ədəbiyyatla tanış edirlər.

A.Hüseynov universitet kitabxanasının həyatında hadisə kimi qiymətləndirilməyə layiq "Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim heyətinin 1921-2011-ci illərdə nəşr etdirdikləri əsərlərinin biblioqrafiyası" adlı toplunun nəşrinin başa çatdırıldığı barədə də Elmi Şura üzvlərini məlumatlandırdı. Dedi ki, biblioqrafiya beş cilddə nəşr olunub. Biblioqrafiyanın işıq üzü görməsində universitetin rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun əvəzsiz köməyi xüsusi qeyd edilməlidir.

A.Hüseynovun çıxışında universitet elektron kitabxanasının tam gücü ilə fəaliyyət göstərdiyi, onun modullarının yeniləşdirildiyi barədə informasiya da yer aldı. Universitetdə aparılan tədris-pedaqoji işin yaxşılaşdırılması, tələbələrin biliklərə dərindən yiyələnmələri istiqamətində kitabxana əməkdaşlarının səylə çalışdıqları, az tapılan dərsliklərin surətinin çıxarılıb tələbələrə çatdırıldığını qeyd olundu. Məlum oldu ki, hesabat ilində universitet kitabxanası-

(Davamı 3-cü səhifədə)

(Əvvəli 2-ci səhifədə)

# Elmi Şuranın iclasında

nın 10.359 üzvü olmuşdur ki, onlar kitabxanaya 406.372 dəfə müraciət etmişlər. Abunəçilər bu dövrdə 501.535 nüsxə ədəbiyyatdan bəhrələnmişlər. "Beləliklə, orta davamiyyət 39, orta oxunuş 49, kitab fondunun dövriyyəsi 0,70 olmuşdur ki, bu da ali məktəb kitabxanası üçün normal hesab oluna bilər. Hesabat ilində kitabxanaya 3.841 nüsxə yeni ədəbiyyatın daxil olmasından sonra kitabxana fondu artıb 711.824 nüsxə təşkil etmişdir" - dedi A.Hüseynov.

A.Hüseynov çıxışında demişdir: "Kitabxananın kollektivi hesabat ilində Azərbaycan Respublikası Prezidentinin fərman və sərəncamlarını, Milli Məclisin qəbul etdiyi qanunları, Təhsil Nazirliyinin və ADPU rektorunun əmr və göstərişlərini əldə rəhbər tutmuş, oxuculara daha yaxşı xidmət etmək, kitab fondunu lazımi ədəbiyyatla komplektləşdirmək, kitabxana informasiya xidmətini müasir səviyyədə təşkil etmək üçün öz işini günün tələbləri səviyyəsində qurmuşdur.

Kitabxananın əməkdaşları eyni zamanda "Azərbaycan Respublikasında Təhsilin inkişafı üzrə Dövlət Strategiyası"ndan irəli gələn məsələləri həyata keçirməyə, xüsusilə elektron kitabxananın sürətli inkişafını təmin edib oxucuların istifadəsinə verməyə çalışırlar. Universitetimizin maddi-texniki bazası artdıqca kitabxana fondu da inkişaf edir".

Cari məsələlər sırasında AMEA-nın A.A.Bakıxanov adına Tarix İnstitutunun direktoru, AMEA-nın müxbir üzvü, professor Yaqub Mahmudovun, Tarix İnstitutunun "Əliyevşünaslıq" şöbəsinin rəhbəri, tarix üzrə elmlər doktoru Ədalət Qasımovun, "Əliyevşünaslıq" şöbəsinin dissertantı Leyla Hüseynovanın "Heydər Əliyev ideyalarının zəfər yürüşü", "Heydər Əliyev Azərbaycan elminin keşiyində", "Heydər Əliyev və Naxçıvan Muxtar Respublikasının sosial-iqtisadi inkişaf tarixi", "Heydər Əliyev irsində Azərbaycan tarixi məsələləri" adlı monoqrafiyalarının və sənədlər toplusunun Azərbaycan Respublikasının Elm, Mədəniyyət və Ədəbiyyat üzrə Dövlət Mükafatının alınmasına dəstək verilməsi və "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"na müvafiq olaraq növbəti dərs ilindən universitetdə riyaziyyat və informatika müəllimliyi, tarix və coğrafiya müəllimliyi, ibtidai sinif müəllimliyi ixtisasları üzrə təhsildə yüksək nəticələr göstərən tələbələrdən ibarət yaradılmış "Sabah" qruplarında tədris prosesinin təşkili və idarə olunması məqsədilə ADPU-da "Sabah" Mərkəzinin yaradılması səsverməyə çıxarıldı.

Daha sonra pedaqoji təcrübənin təşkili ilə əlaqədar məktəblərdən daxil olan rəylər oxundu.

Elmi Şurada Akkreditasiya və Metodşuranın işi haqqında Tədris İşləri üzrə prorektor, professor Malik Cəbrayılov məlumat verdi.

Sonda fəlsəfə doktoru və elmlər doktoru proqramları üzrə dissertasiya mövzularının müzakirəsi və elmi rəhbərlərin təsdiqi keçirildi.

**A.ZİYATXANOĞLU**

# ADPU-da Məzun gününə həsr edilmiş tədbir keçirilib



İyul ayının 1-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Məzun gününə həsr edilmiş tədbir keçirilib. Məzun gününə həsr edilmiş tədbir Azərbaycanın Dövlət Himninin səsləndirilməsi ilə başlanıb. ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov tədbirdə çıxış edərək məzunları və onların valideynlərini bu əlamətdar və xoş gün münasibətilə təbrik edib, onlara ən xoş, ən səmimi arzularını bildirib.

Rektor Yusif Məmmədov öz maraqlı və məzmunlu çıxışında xüsusi qeyd edib ki, hər bir ölkənin inkişafının səviyyəsi onun elm və təhsilinin inkişafının səviyyəsi ilə müəyyən olunur. Elm və təhsilin insan həyatında əvəzsiz rolu var. Elm insandan istedadla bərabər, əməksevərlik, səbr, dözüm, fədakarlıq tələb edir. Elm və sənət qoşa qanaddır. Bəşəriyyət yalnız bu qoşa qanadın sayəsində yüksək zirvələrə ucala bilmişdir.

Təhsil-bilik, bacarıq və qabiliyyətlərin gənc nəslə öyrədilməsi və ötürülməsi prosesidir. Təhsil geniş anlayışdır, onun müxtəlif pillələri, mərhələləri vardır. Təhsil sahəsində qarşıya qoyulan vəzifələr tədris prosesində gerçəkləşdirilir. Məktəb isə cəmiyyətin sosial sifarişini yerinə yetirərək şagirdləri hərtərəfli və dərin elmi biliklərlə təmin etməli, onlarda milli ruh, müasir və geniş dünyagörüşü formalaşdırmalı, bir sözlə, böyüməkdə olan nəsli əsl vətəndaş kimi yetişdirməlidir. Bir faktı xüsusi qeyd etmək istəyirəm ki, ali təhsil bütövlükdə təhsil sisteminin ən mühüm, ən vacib mərhələlərindən biridir. Çünki ali təhsil hər bir ölkənin insan kapitalının formalaşmasında böyük rol oynayır. İnsan kapitalı isə insanın malik olduğu qabiliyyət, qazandığı bilik, bacarıq və motivasiya imkanlarını müəyyən edir. Lakin ali təhsilli mütəxəssis olmaq insan üçün heç də son hədd deyil. Müəllim bütün həyatı boyu öyrətməklə bərabər, həm də özü daim oxuyub-öyrənən, mütaliə edən, öz üzərində çalışan, bilik dairəsini genişləndirən bir şəxsdir. Müəllim təlim-tərbiyə prosesində başlıca fiqur, əsas simadır. Müəllimlik şərəfli, müqəddəs, eyni zamanda çətin və məsuliyyətli bir peşədir. Müəllimin insan həyatında çox böyük rolu var. Müstəqil və müasir Azərbaycan dövlətinin banisi və qurucusu, ulu öndərimiz, ümummilli liderimiz Heydər Əliyev müəllim peşəsini çox yüksək qiymətləndirərək demişdir: "Həyatını müəllimliyə həsr edən insanlar, həqiqətən, fədakar, xalqına, millətinə sədaqətli və eyni zamanda qəhrəmanlıq göstərən insanlardır. Bizim həyatımızda müəllimlik ən hörmətli peşədir. Müəllim cəmiyyətimizdə görkəmli yer tutur. Orta məktəbdə, ali məktəbdə hər bir müəllim bilməlidir ki, onun üzərinə düşən vəzifə, onun dövlət üçün, millət üçün, Azərbaycan xalqı üçün gördüyü iş bütün başqa sahələrdə fəaliyyət göstərən insanların hamısının işindən ən gərəklisidir, ən lazımlısıdır. Azərbaycan ziyalıları arasında müəllimlər xüsusi yer tuturlar, hörmətə layiqdirlər, xüsusi qayğı və diqqətlə əhatə olunmalıdırlar. Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram".

Çıxışına davam edən rektor Y.Məmmədov bildirib ki, bu il ADPU-nun 11 fakültə üzrə əyani şöbəsini 24 ixtisas üzrə 1515 nəfər, qiyabi şöbəsini isə 8 fakültə 9 ixtisas üzrə 516 nəfər tələbə bitirir. Cari tədris ilində ADPU-nu həm də 19 nəfər türkiyəli tələbə bitirir. Bütövlükdə isə bu il ADPU-nu 2031 nəfər tələbə bitirir. Eyni zamanda builki tədris ilində universitetin magistraturasının əyani şöbəsini 41 ixtisas üzrə 167 nəfər, qiyabi şöbəsini isə 21 ixtisas üzrə 135 nəfər magistr bitirir. Ümumilikdə builki tədris ilində ADPU-nun magistraturasını 302 nəfər magistr bitirir.

Respublikamızın bütün ali təhsil müəssisələrində olduğu kimi, bu il ADPU-da da ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr edilmiş yüksək səviyyəli müxtəlif tədbirlər həyata keçirilmişdir. Bu baxımdan, ADPU kollektivinin ölkəmizin tanınmış ziyalılarının iştirakı ilə may ayının 1-də "Heydər Əliyev ideyaları işığında inkişaf edən və yüksələn Azərbaycan" mövzusunda keçirdiyi respublika elmi konfransını, həmçinin may ayının 7-də keçirdiyi ümumuniversitet toplantısını xüsusi qeyd edə bilərik. Bununla yanaşı, ADPU-da may ayının 5-də "Zəmanəmizin böyük azərbaycanlısı", mayın 6-da "Azərbaycan gənclərinin xaricdə təhsil almalarında ulu öndər Heydər Əliyevin xidmətləri" mövzularında tədbirlər, mayın 16-da isə "Təhsilin aktual psixoloji-pedaqoji problemləri" mövzusunda elmi konfrans keçirilmişdir. Həmçinin universitetin bütün fakültələrində ulu öndər Heydər Əliyevin anadan olmasının 91-ci ildönümünə həsr edilmiş elmi konfranslar, dəyirmi masalar, bədii yaradıcılıq festivalı və idman yarışları keçirilmişdir. Mayın 10-da isə universitetdə ilk dərs saatları ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətinə həsr edilmişdir.

Qeyd etdiklərimizlə yanaşı, ölkəmizdə ali pedaqoji təhsilin öncülü sayılan ADPU-nun professor-müəllim heyəti 2013-2014-cü tədris ilində "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda vacib bir vəzifə kimi nəzərdə tutulmuş yuxarı sinif şagirdlərinin peşəyönümlü ixtisas seçimləri sahəsində də əməli fəaliyyət göstərmişdir. Belə ki, "ADPU-nun 2013-2014-cü il tələbə qəbulu ilə əlaqədar peşə oriyentasiyası ilə bağlı tədbirlər planı"na uyğun olaraq universitetimizin bütün fakültələrinin professor-müəllim heyəti və tanınmış məzunları bu ilin aprel-may aylarında Bakı şəhərinin müxtəlif məktəb və liseylərində görüşlər keçirmiş, yuxarı sinif şagirdlərinin müəllim peşəsini seçmələri istiqamətində səmərəli fəaliyyət göstərmişlər. May ayının 15-də isə ADPU-da Bakı şəhərinin müxtəlif orta məktəblərinin müəllim və yuxarı sinif şagirdlərinin iştirakı ilə "Açıq qapı" günü keçirilmişdir. Onu da qeyd edək ki, bu görüşlər Pedaqoji Universitetdə olan ixtisasların təbliğ edilməsi baxımından da mühüm əhəmiyyət kəsb edir. Yeri gəlmişkən, may ayının 13-də ADPU-da "Sabah" qruplarının təqdimatı keçirilmiş, tələbə-gənclərə "Sabah" qruplarının mahiyyəti və onların ölkəmizin gələcək həyatında oynayacağı rol barədə ətraflı məlumat verilmişdir.

Rektor Y.Məmmədov çıxışının bu məqamında deyib: "Ümummilli liderimiz Heydər Əliyevin müdrik ideyalarını çox uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev müəllim adına, müəllim əməyinə yüksək qiymət verir. Artıq 7 ildir ki, ölkəmizdə "Ən yaxşı müəllim" və "Ən yaxşı ümumi təhsil müəssisəsi" müsabiqələri keçirilir. Ölkə Prezidenti cənab İlham Əliyev hər il "Ən yaxşı müəllim" müsabiqəsində müvəffəqiyyət qazandıqlarına görə 100 nəfər müəllimin 5 min manat məbləğində, eləcə də "Ən yaxşı ümumi təhsil müəssisəsi" müsabiqəsində müvəffəqiyyət qazandıqlarına görə 50 ümumi təhsil müəssisəsinin 10 min manat məbləğində birdəfəlik pul mükafatı ilə mükafatlandırılmaları haqqında müvafiq sərəncamlar imzalayır. Dövlət başçımızın bu sərəncamları təbii ki, cəmiyyətdə müəllim adının, müəllim nüfuzunun yüksəldilməsinə yönəlmiş növbəti vacib bir addımdır və nəticə etibarilə müəllim əməyinin, pedaqoji fəaliyyətin stimullaşdırılmasına xidmət edir. Hazırda ölkəmizdə müəllimlərə və səhiyyə işçilərinə dövlət qulluqçusu statusu verilməsi istiqamətində lazımi tədbirlər həyata keçirilir və bu da öz növbəsində bu peşə sahiblərinin cəmiyyətdə nüfuzunun daha da yüksəldilməsində və sosial müdafiələrinin gücləndirilməsində mühüm rol oynayacaqdır.

Qeyd etdiklərimlə yanaşı, ölkənin birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, Yeni Azərbaycan Partiyasının Sədr müavini, millət vəkili, YUNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyevanın şəxsi təşəbbüsü və təşkilatçılığı ilə respublikamızın bütün bölgələrində çoxlu sayda yeni və müasir tipli məktəb binaları inşa edilib, təhsil işçilərinin və şagirdlərin istifadəsinə verilir. Həmin məktəblər müasir informasiya-kommunikasiya texnologiyaları ilə təmin edilir, şagirdlərin yüksək səviyyədə təhsil almaları üçün hər cür şərait yaradılır. Mehriban xanım Əliyevanın həyatımızın digər sahələrində olduğu kimi, təhsil, maarifçilik sahəsindəki belə səmərəli fəaliyyəti də xalqımız tərəfindən çox yüksək qiymətləndirilir. Fondun bu yaxınlarda məktəbəqədər təhsilin keyfiyyətinin yüksəldilməsi ilə bağlı təqdim etdiyi layihə də təqdirəlayiqdir və biz bu layihənin məktəbəqədər təhsilinin inkişafına müsbət təsir göstərəcəyinə inanırıq".

Rektor Y.Məmmədov öz çıxışında xatırladıb ki, 2012-ci il aprel ayının 20-də ADPU özünün 90 illik yubileyini yüksək səviyyədə qeyd etdi. Azərbaycan Prezidenti İlham Əliyevin 18 aprel 2012-ci il tarixli sərəncamları ilə ADPU-nun 38 nəfər əməkdaşı ölkəmizdə təhsilin inkişafındakı xidmətlərinə görə və universitetin 90 illik yubileyi münasibətilə müxtəlif yüksək dövlət mükafatları ilə təltif edildilər. Həmçinin yubiley münasibətilə Təhsil Nazirliyinin əmrləri əsasında ADPU-nun 56 nəfər əməkdaşı, universitetdaxili əmrlərlə isə 118 nəfər əməkdaşımız müxtəlif mükafatlara layiq görüldülər. Bütövlükdə isə son 8 ildə universitetimizin 90-dan çox əməkdaşı ölkə rəhbərinin müvafiq sərəncamları ilə müxtəlif yüksək dövlət mükafatları ilə təltif edilmişlər. Rektor Y.Məmmədov bir daha şəxsən öz adından və universitetimizin çoxminli kollektivi adından dövlət başçımıza bu yüksək təltifatlara görə öz dərin təşəkkürünü bildirmişdir.

Onu da qeyd edək ki, əvvəlki illərdə olduğu kimi, cari tədris ilində də ADPU-da təhsilin keyfiyyətinin yaxşılaşdırılması, əmək intizamının, habelə maddi-texniki bazanın, elmi-pedaqoji kadr potensialının gücləndirilməsi, universitetdə aparılan elmi-tədqiqat işlərinin səviyyəsinin yüksəldilməsi, beynəlxalq əlaqələrin genişləndirilməsi, həmçinin universitet kollektivinin maddi-sosial vəziyyətinin yaxşılaşdırılması və s. sahələrdə səmərəli əməli tədbirlər həyata keçirilmişdir.

Rektor Y.Məmmədov bu il universiteti bitirən məzunlara xitabən bildirmişdir ki, sizin məzunu olduğunuz ADPU ölkəmizdə ali pedaqoji təhsilin flaqmanı olmaqla yanaşı, həm də respublikamızın qabaqcıl və nüfuzlu ali təhsil müəssisələrindən biridir. Böyük qürur hissi ilə deyə bilərik ki, zəngin tarixi inkişaf yolu keçən ADPU fəaliyyət göstərdiyi dövr ərzində respublikamız üçün müxtəlif ixtisaslar üzrə 150 mindən çox yüksək səviyyəli pedaqoji kadrlar hazırlamışdır. Pedaqoji Universitetin məzunları bu gün respublikamızın müxtəlif ali məktəblərində, elmi-tədqiqat institutlarında, orta ixtisas, orta ümumtəhsil və məktəbəqədər təhsil müəssisələrində, həmçinin dövlət idarəçiliyinin ayrı-ayrı sahələrində uğurla fəaliyyət göstərirlər.

ADPU ölkəmizin təhsil müəssisələri üçün kadr hazırlığı ilə yanaşı, həm də xarici ölkələr üçün elmi-pedaqoji kadr hazırlığı sahəsində mühüm xidmətlər göstərmişdir. Pedaqoji Universitetin məzunları sırasında ölkəmizdə və onun hüdudlarından kənarda tanınan çoxsaylı alimlər, ictimai-siyasi xadimlər, yazıçı və şairlər, bəstəkarlar, xalq qəhrəmanları bu ali təhsil müəssisəsinin nüfuzunun daha geniş miqyasda artmasında, yüksəlməsində mühüm rol oynamışlar. Səməd Vurğun, Cəfər Xəndan, Feyzulla Qasımzadə, Həmid Araslı, Mikayıl Rəfili, Yusif Məmmədəliyev, Zahid Xəlilov, Həsən Abdullayev, Mehdi Mehdizadə, Məcid Rəsulov, Heydər Hüseynov, Şıxəli Qurbanov, Budaq Budaqov, Məmməd Araz, İsmayıl Şıxlı, Gəray Fəzli, Ərtoğrol Cavid, Əyyub Abbasov, Səid Rüstəmov, Mehdi Hüseynzadə və digər görkəmli şəxsiyyətlər bu məzunların sırasında xüsusi şərəfli yer tuturlar. Böyük fəxrlə deyə bilərik ki, AMEA-nın indiyə qədər 10 prezidentindən 3-ü-Yusif Məmmədəliyev, Zahid Xəlilov, Həsən Abdullayev ADPU-nun məzunlarıdır. İnanıram ki, siz onların yolunu layiqincə davam etdirəcəksiniz.

Rektor Y.Məmmədov çıxışının sonunda bir daha universiteti bitirən tələbə-gəncləri təbrik etmiş, onlara gələcək həyatlarında və pedaqoji fəaliyyətlərində uğurlar arzulamışdır.

Sonra universiteti "əla" qiymətlərlə bitirən Biologiya fakültəsinin əyani şöbəsinin IV kursunun 402-ci qrup tələbəsi Şəfiqə Həsənovaya, Botanika ixtisası üzrə əyani şöbənin II kurs magistri Tünzalə Abbasovaya, Kimya fənninin tədrisi metodikası və metodologiyası ixtisası üzrə əyani şöbənin II kurs magistri İlahə Yusifovaya, İqtisadi və sosial coğrafiya ixtisası üzrə əyani şöbənin II kurs magistri

Pakizə Orucovaya, Xarici dilin tədrisi metodikası və metodologiyası ixtisası üzrə əyani şöbənin II kurs magistri Şəkər Mehdiliyə fərqlənmə diplomları təqdim edilmiş, həmçinin ADPU-nun idmanda və bədii yaradıcılıq sahəsində uğur qazanan tələbələri haqqında məlumat verilmişdir.

Məzunlar adından çıxış edən Şəfiqə Həsənova ADPU-nun rektoru, professor Yusif Məmmədova universitetdə tələbə-gənclər üçün yaradılan yüksək təhsil şəraitinə görə öz təşəkkürünü bildirmişdir.

Daha sonra "Məzun-2014" şarı havaya buraxılmışdır.

Tədbir konsert proqramı ilə davam etmişdir.

**Mənsur İBRAHİMLİ,**
**Gülnar SÜLEYMANOVA**



# Şəffaflıq və obyektivlik başlıca meyardır

***Məlum olduğu kimi, Azərbaycan Respublikasının Təhsil Naziri cənab Mikayıl Cabbarov bu il may ayının 8-də "İmtahan sessiyasının təşkili və keçirilməsi barədə" 558 nömrəli əmr imzalamışdır. Həmin əmrdə ali təhsil müəssisələrində 2013-2014-cü tədris ilinin yaz semestrinin imtahan sessiyasını mövcud qaydalara uyğun təşkil edilməsi, tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığın və obyektivliyin təmin edilməsi, ali təhsil müəssisələrində imtahan qərargahlarının yaradılması və bu qərargahlara daxil olan hər bir şikayətin qısa müddətdə çevik şəkildə araşdırılıb müvafiq tədbir görülməsi, həmçinin imtahanlarda ictimaiyyətin və valideynlərin iştirakına şərait yaradılması öz əksini tapmışdır.***

Təhsil Nazirinin bu əmrindən irəli gələn vəzifələrin yerinə yetirilməsi məqsədilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun müvafiq əmrinə əsasən universitetdə 11 nəfərdən ibarət imtahan qərargahı yaradılmışdır. İmtahan qərargahının sədri Mexanika və molekulyar fizika kafedrasının müdiri, professor Edil Eyvazov, müavini Funksiyalar nəzəriyyəsi kafedrasının müdiri, professor Rəhim Rzayev, katibi isə Analitik və fiziki kimya fakültəsinin dosenti Azər Sərdarlıdır. İmtahan qərargahının tərkibinə universitetin Elmi katibi, dosent Laçın Həsənova, Ümumi psixologiya kafedrasının müdiri, professor Ramiz Əliyev, Ümumi pedaqogika kafedrasının müdiri, professor İramin İsayev, Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının müdiri, professor Əzizxan Tanrıverdiyev, Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının müdiri, dosent Rəcəb Əliyev, Əcnəbi tələbələrin işi üzrə fakültənin dekanı, dosent Nurəddin Uluxanlı, Botanika kafedrasının müdiri, dosent Anaxanım Yusifova, Xarci dillər kafedrasının müdiri, dosent Gülçöhrə Alıyeva daxil edilmişlər.



ADPU-da hazırda yaz semestrinin imtahan sessiyası davam edir. ADPU-nun Tədris-metodika şöbəsinin müdiri, dosent Namiq Hacıyevin verdiyi məlumata görə, hazırda universitetin əyani şöbəsində 24 ixtisas üzrə 6273 tələbə təhsil alır ki, onlardan da 90 nəfəri əcnəbi vətəndaşlardır. Bundan əlavə, universitetin qiyabi şöbəsində 9 ixtisas üzrə 1845 tələbə təhsil alır. Magistratura pilləsində isə əyani və qiyabi yolla təhsil alanların sayı isə 912 nəfərdir. Artıq 7 ildir ki, universitetin əyani şöbəsində tələbələr kredit sistemi əsasında təhsil alırlar. Həmin tələbələr bütün imtahanları test üsulu ilə verirlər. Qeyd edək ki, kredit sistemi artıq özünü tam doğrultmuş, imtahanların test üsulu və kompyuter vasitəsilə aparılması tələbələrin böyük razılığına səbəb olmuşdur. Bu məqsədlə universitetdə beş kompyuter imtahan zalı yaradılmışdır. Həmin zallarda yerləşdirilmiş 200 kompyuter vasitəsilə gün ərzində 1500-1600 nəfər tələbə imtahan verə bilir. İmtahanlara nəzarəti gücləndirmək məqsədilə bütün zallarda xüsusi kameralar quraşdırılmışdır. İmtahan zalında yanaşı oturan müxtəlif fakültələrin tələbələri, həm də ayrı-ayrı ixtisaslar üzrə imtahan verirlər ki, bu da onların bir-birinə kömək etməsinin qarşısını almaq məqsədi daşıyır.



Artıq bir neçə ildir ki, qiyabi şöbədə də imtahanların test üsulu ilə keçirilməsinə başlanılmışdır. Hazırda yalnız qiyabi yolla təhsil alan beşinci kurs tələbələri üçün imtahanlar ənənəvi sistemlə aparılır. Bu zaman tələbə çəkdiyi biletə düşən sualları yazılı şəkildə cavablandırır. Tələbənin yazılı cavabı kodlaşdırılaraq məxfilik gözlənilməklə yoxlanılmaq üçün təqdim olunur. Həmin fənni tədris edən müəllim və ya müvafiq kafedra müdirinin iştirakı ilə tələbənin yazılı cavabı yoxlanılaraq qiymətləndirilir. Bir sözlə, son illər ADPU-da imtahanların keçirilməsində tətbiq olunan bütün yeniliklər tələbələr və onların valideynləri tərəfindən rəğbətlə qarşılanır.

İmtahan-nəzarət qrupunun rəhbəri, dosent Nurəddin Uluxanlı bildirdi ki, hər bir tələbəyə imtahan verdiyi fənndən beş cavab variantından ibarət 25 sual təqdim olunur. Tələbənin düzgün cavablandırdığı hər bir sual 2 balla qiymətləndirilir. Beləliklə də, tələbənin imtahanqabağı topladığı balla imtahanın nəticəsi cəmlənərək yekun qiymət müəyyənləşdirilir və bu, dərhal kompyuterin ekranında öz əksini tapır.

İmtahan qərargahının üzvü, professor Ramiz Əliyev qeyd etdi ki, qərargahın fəaliyyət dairəsinə semestr dövründə imtahanların təşkili və keçirilməsinə nəzarət etmək, imtahanların təşkili və imtahan prosesi zamanı yarana biləcək mümkün münaqişəli vəziyyətlərlə bağlı daxil olmuş müraciətləri vaxtında araşdırıb müvafiq qərarlar qəbul etmək, akademik borcların ləğvində, həmçinin imtahanlarda tələbələrin biliyinin qiymətləndirilməsində obyektivliyi və şəffaflığı təmin etmək kimi mühüm məsələlər aiddir. Eyni zamanda imtahandan aldığı qiymətlə razılaşmayan tələbələr isə fakültələr və universitet üzrə yaradılmış münaqişə komissiyalarına, həmçinin qərargaha müraciət edirlər. Qərargahın normal fəaliyyəti üçün ayrılmış iş otağına telefon xətti çəkilmiş, növbətçilik cədvəli yaradılmışdır. Qərargah üzvləri mütəmadi şəkildə imtahan zallarında olur, onlara ünvanlanan müraciət və təkliflərlə bağlı müvafiq qeydlər aparırlar. Bütün bu məsələlər isə hər həftənin şənbə günü müzakirə edilir və müvafiq qərarlar qəbul olunur. Bundan əlavə, universitetimizdə valideynlərlə əlaqələrin yaradılmasına da xüsusi diqqət yetirilir ki, bu da onlarda imtahanların gedişi barədə doğun təsəvvürün formalaşdırılmasına xidmət edir. Qərargah üzvləri tərəfindən hər hansı müraciətin araşdırılması və qəbul olunmuş qərar qarşı tərəfi qane etmədikdə və ya müraciətlər komissiya üzvlərinin səlahiyyətlərinə aid olmadıqda rektorluğa müraciət edilir və narazı tərəfin iştirakı ilə məsələyə baxılır. İmtahan qərargahının əlaqə telefonları (012) 408-30-29 və (012) 498-17-94-dür.

Qeyd edək ki, 2011-2012-ci tədris ilinin yaz imtahan sessiyasından etibarən ADPU-da imtahanların yeni bir metod tətbiq edilməklə iki mərhələdə keçirilməsinə başlanmışdır. Belə ki, universitetin Elmi Şurasının müvafiq qərarına əsasən, "yaxşı" və "əla" qiymət almaq istəyən tələbələr elektron test üsulu ilə imtahan verdikdən sonra kompyuterin müvafiq düyməsini basmaqla elə həmin anda eyni fəndən yazılı imtahana buraxılmaq imkanı əldə edirlər. Xatırladaq ki, bu metodun tətbiq edilməsindən əsas məqsəd tələbələri əzbərçilikdən, şablonçuluğa, meyilliliklən uzaqlaşdırmaq, imtahanlara daha ciddi şəkildə hazırlaşmağa sövq etmək, eyni zamanda onlarda fikirlərini yazılı şəkildə ifadə etmək bacarığını formalaşdırmaq, bir sözlə, onların yazılı nitq mədəniyyətini inkişaf etdirməkdən ibarətdir. Əgər yazılı imtahanda tələbə yüksək bilik nümayiş etdirə bilmirsə, onda onun kompyuter vasitəsilə test suallarını cavablandırarkən aldığı yekun qiymət olduğu kimi saxlanılır.

Bəs, tələbələrin bu üsula münasibəti necədir? Könül Quluzadə Filologiya fakültəsinin II kurs tələbəsidir. Semestr boyu yaxşı hazırlıq nümayiş etdirib, yaz sessiyası çərçivəsində indiyədək verdiyi üç imtahanın hamısından yüksək nəticə əldə edib. "Müasir Azərbaycan dili" fənni üzrə ona verilmiş test suallarını yüksək səviyyədə cavablandırdığı üçün yazılı imtahan verməyə hazırlaşır. O, eyni gündə bir fənndən həm test, həm də yazılı imtahan verməyin nəticə etibarilə yüksək hazırlıqlı tələbələrin aşkara çıxarılması və onların öz hazırlıq səviyyələrini tam nümayiş etdirmələri baxımından xüsusi əhəmiyyət daşıdığını bildirdi. Söhbət etdiyimiz digər tələbələr də ikinci mərhələdə keçirilən yazılı imtahanların onların xeyrinə olan bir amil kimi dəyərləndirdilər.

Yeri gəlmişkən, yaz semestrinin imtahan sessiyasında Kompyuter Mərkəzində imtahanların mövcud qaydalara uyğun təşkil edilməsi və keçirilməsi üçün İmtahan-nəzarət qrupunun rəhbəri Nurəddin Uluxanlı, onun müavini Kərim Quliyev, qrup rəhbəri Vahid Vəliyev, nəzarətçi-müəllimlər Nazim Hüseynov, Amid Qurbanov, Yeganə Heydərova, Arzu Kərimova, Hamlet Abbasov, Nizami Məmmədov, nəzarətçilər Svetlana Nuriyeva, Aytən Tarverdiyeva, Gülarə Şirinova, Firuzə Salahova, Məlahət Məmmədova, Mehriban Vəliyeva, Gülnar Abıyeva, Bəhram Məmmədov xüsusi fəallıq nümayiş etdirirlər. Universitet daxilində, eləcə də tədris auditoriyalarında və imtahan zallarında yaradılmış səliqə-sahman da göz oxşayır. Bütün bunlar isə universitetdə inzibati-təsərrüfat işlərinin yüksək səviyyədə təşkil olunmasından xəbər verir.

Eyni zamanda ADPU-nun mühafizə xidmətinin baş mühafizəçisi Şamil Cəfərzadə, mühafizəçilər Seymur İsgəndərov, Ceyhun Pirişov, Əfqan Rəhimov və Məhəmməd Bayramov universitetdə sabitliyin və asayişin təmin edilməsi və daxili nizam-intizam qaydalarının yüksək səviyyədə qorunması üçün əzmlə fəaliyyət göstərirlər.



Məlumat üçün onu da qeyd edək ki, hazırda universitetdə yekun dövlət attestasiya imtahanlarına ciddi hazırlıq işləri həyata keçirilir.

**Mənsur QÜDRƏTOĞLU,**
**Gülnar BƏXTİYARQIZI**

***Azərbaycan Respublikası Prezidentinin 2014-cü il 2 aprel tarixli Sərəncamı ilə TƏSDİQ EDİLMİŞDİR***

# Azərbaycan Respublikasında informasiya cəmiyyətinin inkişafına dair 2014-2020-ci illər üçün MİLLİ STRATEGİYA

**1.Giriş**

Azərbaycan Respublikasının gələcək inkişaf strategiyasının əsas istiqamətləri qeyri-neft sektorunun inkişafı hesabına davamlı iqtisadi artıma və tərəqqiyə nail olunması və iqtisadiyyatın şaxələndirilməsidir. Bu məqsədlə ölkəmizin ümumi daxili məhsulunun tərkibində, həmçinin dövlət büdcəsinin formalaşdırılmasında təbii ehtiyatlar amilinin azaldılması və qeyri-neft amilinin üstünlüyünün təmin edilməsi, iqtisadiyyatda innovasiyaların tətbiqinin genişləndirilməsi üçün güclü motivasiya mexanizmlərinin yaradılması və inkişaf etdirilməsi nəzərdə tutulur. Mövcud resurslardan və coğrafi mövqelərdən istifadə olunmaqla, Azərbaycan Respublikasının bütün bölgələrinin sosial-iqtisadi inkişafının müasir tələblər səviyyəsində təmin edilməsi və iqtisadiyyatımızın rəqabət qabiliyyətinin yüksəldilməsi milli məhsulların dünya bazarında layiqli yer tutmasına şərait yaradacaqdır. Bu məqsədlər Azərbaycan Respublikası Prezidentinin 2012-ci il 29 dekabr tarixli 800 nömrəli Fərmanı ilə təsdiq edilmiş "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyası"nda (bundan sonra - Konsepsiya) öz əksini tapmışdır. Konsepsiyada əsas hədəf qarşıdakı səkkiz-on ildə Azərbaycan Respublikasında əsasən qeyri-neft sektorunun inkişafı hesabına ümumi daxili məhsulun 2 dəfə artırılması və bu artımın respublikada innovasiyayönlü və biliyə əsaslanan iqtisadiyyatın qurulması hesabına həyata keçirilməsidir. Belə inkişafın əsas dayaqlarından biri informasiya və kommunikasiya texnologiyalarıdır (bundan sonra - İKT). İKT yüksək artım tempinə malik yeni iqtisadi sektor kimi müasir və çoxtəyinatlı infrastruktur, habelə hərtərəfli sosial-iqtisadi tərəqqinin aparıcı qüvvəsi rolunu oynayır.

Bu gün İKT respublikanın davamlı və dayanıqlı inkişafının təmin edilməsi, intellektual potensialının gücləndirilməsi, biznesin irəliləməsi, korrupsiya ilə mübarizə, yoxsulluq və işsizliyin azaldılması, cəmiyyətdə şəffaflığın və demokratiyanın inkişaf etdirilməsi üçün əlverişli vasitə olaraq qəbul edilir. Dövlət idarəçiliyi, təhsil, səhiyyə, biznes, bank işi və digər sahələrdə yeni dəyərlər yaradan İKT ictimai-iqtisadi münasibətlərin vacib tərkib hissəsinə çevrilmişdir. İnternet mediasının inkişafı, internetdə fikir və söz azadlığının mövcudluğu, elektron qəzet və jurnalların, xarici və daxili sosial şəbəkələrin geniş yayılması İKT-nin cəmiyyətə verdiyi yeni imkanlardır.

Konsepsiyada müəyyən edilmiş əsas hədəfə çatmaq üçün növbəti on ildə İKT sektorunun həcminin 4-4,5 dəfə genişləndirilməsi, İKT-nin iqtisadi potensialının gücləndirilməsi, cəmiyyətin İKT ehtiyaclarının ödənilməsi tələb olunur. Bunlara nail olmaq üçün innovativ, rəqabətqabiliyyətli və ixracyönlü İKT potensialının formalaşdırılması, ölkənin regional informasiya xidmətləri mərkəzinə çevrilməsi, kosmik sənayenin inkişaf etdirilməsi və peyk texnologiyalarının geniş tətbiqi, vətəndaşların və cəmiyyətin mövcud imkanlardan, məhsul və xidmətlərdən səmərəli bəhrələnməsi üçün şərait yaradılması və onların İKT biliklərinin, bacarıqlarının və hazırlığının yüksəldilməsi, "elektron hökumət"in inkişaf etdirilməsi və dövlət idarəçiliyinin bütün səviyyələrində elektron xidmətlərdən istifadə edilməsi, həmçinin mövcud İKT infrastrukturunun və İKT istifadəçilərinin informasiya təhlükəsizliyinin təmin edilməsi, yüksəkixtisaslı mütəxəssislərin və elmi kadrların hazırlanması, görülən işlərə elmi dəstək verilməsi, ölkənin qlobal informasiya məkanına sıx inteqrasiyası vacibdir.

İKT-nin, o cümlədən internet iqtisadiyyatının inkişaf etdirilməsi ənənəvi iqtisadi sahələrin inkişafında da mühüm rol oynayacaqdır. Məhz internet iqtisadiyyatı yeni istifadə və iştirak mühitlərinin yaranmasına, məhsuldarlığın artırılmasına, rəqiblər üzərində strateji üstünlüyün əldə olunmasına, tərəfdaşlarla münasibətlərin möhkəmləndirilməsinə, informasiya resurslarından optimal istifadəyə və bütövlükdə cəmiyyətin rifahının yaxşılaşdırılmasına şərait yaradır.

Bütün bu məqsədlərə çatmaq və nəzərdə tutulan işləri sistemli şəkildə həyata keçirmək üçün "Azərbaycan Respublikasında informasiya cəmiyyətinin inkişafına dair 2014-2020-ci illər üçün Milli Strategiya" (bundan sonra - Milli Strategiya) hazırlanmışdır.

Bu Milli Strategiya Azərbaycan Respublikası Prezidentinin 2003-cü il 17 fevral tarixli 1146 nömrəli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasının inkişafı naminə informasiya və kommunikasiya texnologiyaları üzrə Milli Strategiyaya (2003-2012-ci illər)" və həmin strategiyanın həyata keçirilməsi ilə bağlı qəbul olunmuş dövlət proqramlarının icrası yönündə görülmüş genişmiqyaslı işlərin nəticələrinə əsaslanır. Əldə olunmuş nəticələr, informasiya cəmiyyətinin əsaslarının yaradılması, vətəndaşlar, cəmiyyət, özəl sektor və dövlət orqanları tərəfindən İKT-dən geniş istifadə növbəti mərhələdə fəaliyyət istiqamətlərinin planlaşdırılması üçün əlverişli şərait yaradır. Cəmiyyətin müasir rabitə və informasiya texnologiyalarına olan tələbatı, dünya təcrübəsi, beynəlxalq təşkilatların, o cümlədən Beynəlxalq Telekommunikasiya İttifaqının (bundan sonra - BTİ), Avropa İttifaqının, UNESCO-nun tövsiyələri, "Açıq hökumət təşəbbüsü" nəzərə alınmaqla hazırlanmış Milli Strategiya Konsepsiyada İKT sahəsinin qarşısında qoyulan vəzifələrin yerinə yetirilməsi üzrə dövlətin siyasətini əks etdirir, əsas məqsəd və vəzifələri, prioritetləri və fəaliyyətin əsas istiqamətlərini müəyyənləşdirir.

**2. Cari vəziyyət**

Azərbaycan Respublikasında İKT-nin inkişaf etdirilməsi üçün görülən işlər nəticəsində ölkənin ümumdünya elektron məkanına daha sürətli inteqrasiyası, sosial və iqtisadi fəaliyyətin yeni formalarının (e-hökumət, e-ticarət, distant təhsil və s.) təşəkkül tapması, informasiya və bilik bazarının yaradılması, iqtisadiyyatın müxtəlif sahələrində səmərəliliyin artırılması, məhsul və xidmətlərin keyfiyyətinin yüksəldilməsi istiqamətində mühüm addımlar atılmışdır. Dövlətin xüsusi diqqətində olan bu sahənin ölkə iqtisadiyyatının gələcək inkişafı üçün prioritetlərdən olduğu bəyan edilmiş və Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 16 yanvar tarixli 2664 nömrəli Sərəncamı ilə 2013-cü il Azərbaycan Respublikasında "İnformasiya-kommunikasiya texnologiyaları ili" elan edilmişdir.

2003-2013-cü illər ərzində İKT sahəsinə dövlət tərəfindən yüksək diqqət və qayğı göstərilmiş, məqsədyönlü, kompleks və ardıcıl fəaliyyət həyata keçirilmişdir. Məhz bunun təzahürüdür ki, bir çox beynəlxalq hesabatlarda, o cümlədən Dünya İqtisadi Forumunun "The Global Information Technology Report" hesabatında Azərbaycan Respublikasının İKT sahəsindəki nəticələri nəzərə alınmağa başlanılmış və 2013-cü ilin hesabatında "İKT-yə dəstəkdə hökumətin uğurları" və "Hökumətin gələcək baxışlarında İKT-yə verilən əhəmiyyət" indekslərinə görə ölkəmiz dünya üzrə ilk onluqda yer almışdır. Ümumilikdə isə bu hesabatda Azərbaycan şəbəkə hazırlığı indeksi üzrə 144 ölkə arasında 56-cı yeri tutmuş və MDB ölkələri arasında liderlər qrupunda olmuşdur.

Bu illər ərzində sahə üzrə inkişafı təmin etmək üçün müvafiq hüquqi baza yaradılmış, bir çox vacib qanunlar və digər normativ hüquqi aktlar qəbul olunmuşdur.

2005-ci və 2010-cu illərdə Azərbaycan Respublikası Prezidentinin müvafiq sərəncamları ilə təsdiq edilmiş Azərbaycan Respublikasında rabitə və informasiya texnologiyalarının inkişafı üzrə dövlət proqramları, həmçinin Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2010-cu il 14 may tarixli 136s nömrəli sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında 2010-2011-ci illərdə "Elektron hökumət"in formalaşdırılması üzrə Fəaliyyət Proqramı" İKT-nin inkişafı ilə bağlı əməli tədbirlərin həyata keçirilməsini təmin etmişdir.

Bu hüquqi aktlar ölkəmizdə İKT-nin inkişafı üçün yeni imkanlar açmaqla yanaşı, sahə üzrə azad bazar və sağlam rəqabət prinsiplərinin gözlənilməsinə, vətəndaşların və dövlət orqanlarının İKT-dən geniş istifadə etməsinə şərait yaratmışdır.

Son illərdə İKT sektoru iqtisadiyyatın aparıcı və dinamik inkişaf edən sahəsinə çevrilmişdir. Bu illər ərzində sektorun həcmi təqribən 20-25% orta illik artım tempi ilə hər üç ildə iki dəfə artaraq 1,9 milyard ABŞ dollarını ötmüş, ÜDM-də payı 1,7%-ə, qeyri-neft ÜDM-də payı isə 3,3%-ə yüksəlmişdir. Sektora investisiya qoyuluşu təqribən 2,5 milyard ABŞ dolları təşkil etmişdir ki, bunun da 28%-i dövlət, 72%-i isə yerli biznes strukturları və xarici investorlar tərəfindən yatırılmışdır. Özəl sektorun payı 2003-cü illə müqayisədə 67,3%-dən 80%-ə yüksəlmişdir.

MDB ölkələri arasında ilk dəfə Azərbaycan Respublikasında sabit telefon şəbəkəsi tam elektronlaşdırılmış və ölkənin bütün yaşayış məntəqələri telefonlaşdırılmışdır. Respublikanın bütün rayon mərkəzləri magistral fiber-optik telekommunikasiya şəbəkəsinə qoşulmuşdur.

Mobil şəbəkə genişləndirilmişdir. Respublikada mövcud olan üç mobil operator tərəfindən müasir 3G xidmətləri göstərilir. 2012-ci ildən ölkəmizdə 4G texnologiyasının da tətbiqinə başlanılmışdır. Ölkədə hər 100 nəfərə 110 mobil abunəçi düşür.

2013-cü ilin nəticələrinə görə Azərbaycan əhalisinin 70%-i internet istifadəçisidir, o cümlədən onların 50%-i genişzolaqlı internet istifadəçisidir. İnternet qiymətləri ildən-ilə azalır, belə ki, 2004-cü illə müqayisədə 1 Mbit/s sürətli internetə qoşulmanın qiyməti 1200 manatdan 10 manata enmişdir. Ölkə üzrə genişzolaqlı xidmətlərə qoşulmanın orta qiyməti orta aylıq əməkhaqqının 3%-ni təşkil edir və bu da BTİ-nin inkişaf etməkdə olan ölkələrdə bu nisbətin 2015-ci ilədək 5%-dən az olması hədəfinə artıq nail olunması deməkdir.

Son beş ildə beynəlxalq internet kanalının tutumu 12,9 dəfə artaraq 200 Gbit/s-yə çatmış, internet xidmətləri bazarının həcmi təxminən 4 dəfə artmışdır.

2013-cü il fevralın 8-də Azərbaycan Respublikasının ilk telekommunikasiya peyki "Azerspace-1" orbitə çıxarılmışdır ki, bu da ölkəmizin müstəqillik dövründə əldə etdiyi ən yüksək texniki nailiyyətlərdəndir. Avropa, Yaxın Şərq, Orta Asiya və Afrika ölkələrinə telekommunikasiya, internet, televiziya-radio yayımı xidmətləri göstərməyə imkan verən peykin artıq kommersiya istismarına başlanılmışdır və o, yaradılmış infrastruktur vasitəsilə azərbaycanlı mütəxəssislər tərəfindən idarə olunur.

2015-ci ilə qədər rəqəmli yayıma keçidi təmin etmək barədə BTİ-nin tövsiyələrinə uyğun olaraq, ölkəmizdə aparılan işlər yekunlaşmaq üzrədir. Bu illər ərzində poçt sahəsində xidmətlərin çeşidinin və keyfiyyətinin yüksəldilməsi, infrastrukturun müasirləşdirilməsi, kadr potensialının gücləndirilməsi, sahə üzrə fəaliyyətin liberallaşdırılması istiqamətində ardıcıl işlər görülmüşdür. 2005-2010-cu illərdə Dünya Bankının dəstəyi ilə "Maliyyə xidmətlərinin inkişafı" layihəsinin icrası nəticəsində milli poçt operatoru "Azərpoçt" MMC-nin şəbəkəsindən istifadə olunmaqla ənənəvi xidmətlərlə yanaşı, poçt şöbələri vasitəsilə əhaliyə bank-maliyyə xidmətlərinin göstərilməsi də təmin edilmişdir.

Azərbaycan Respublikasında kompyuter və elektron avadanlıqlarının, proqram məhsullarının istehsalı ildən-ilə artır. Son 5 il ərzində ölkənin informasiya texnologiyaları (bundan sonra - İT) sektoru təqribən 2 dəfə genişlənmiş və orta illik artım tempi 17% təşkil etmişdir.

Ölkədə "elektron hökumət"in formalaşdırılmasına ciddi diqqət yetirilir və məmur-vətəndaş münasibətlərinin İT vasitələrindən istifadə etməklə sadələşdirilməsi, şəffaflaşdırılması bürokratik əngəllərin qarşısının alınmasına xidmət edir. Ölkədə "elektron hökumət"in zəruri infrastrukturları yaradılmışdır. "Elektron hökumət" portalı artıq fəaliyyət göstərir, dövlət orqanlarının informasiya sistemləri arasında xüsusi infrastruktur vasitəsilə informasiya mübadiləsi aparılır, elektron imzanın istifadəsi üçün infrastruktur və sertifikat xidmətləri mərkəzləri yaradılmışdır. Nəticədə e-imzanın tətbiqi genişlənir, dövlət orqanları tərəfindən müxtəlif elektron xidmətlər göstərilir. Hazırda "Elektron hökumət" portalına qoşulmuş dövlət qurumlarının elektron xidmətləri "bir pəncərə" prinsipi əsasında əhaliyə təqdim edilir. "Elektron hökumət" portalı haqqında Əsasnamə"nin təsdiq edilməsi və elektron xidmətlərin genişləndirilməsi ilə bağlı tədbirlər barədə Azərbaycan Respublikası Prezidentinin 5 fevral 2013-cü il tarixli 813 saylı Fərmanı bu sahədə aparılan işlərə xüsusi təkan vermişdir.

Qeyd edilənlərlə yanaşı, vətəndaşlara xidmətlərin daha keyfiyyətli, rahat, vahid məkandan və müasir innovasiyaları tətbiq etməklə həyata keçirilməsi, dövlət orqanlarının informasiya bazalarının qarşılıqlı inteqrasiyası, elektron xidmətlərin təşkili prosesinin sürətləndirilməsi, bu sahədə idarəetmə sisteminin təkmilləşdirilməsi məqsədi ilə Azərbaycan Respublikası Prezidentinin 2012-ci il 13 iyul tarixli 685 nömrəli Fərmanı ilə Azərbaycan Respublikasının Prezidenti yanında Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar üzrə Dövlət Agentliyi və onun tabeliyində "ASAN xidmət" mərkəzləri yaradılmışdır ki, bu da qısa müddətdə özünü müsbət təcrübə kimi doğrultmuşdur.

Əldə olunmuş bu inkişafdan irəli gələrək yaradılmış infrastrukturların, informasiya sistemlərinin, toplanılmış məlumatların mühafizəsinin təşkili, həmçinin bu imkanlardan vətəndaşların və digər istifadəçilərin sərbəst istifadəsinə şərait yaradılması baxımından informasiya təhlükəsizliyi məsələləri vacib əhəmiyyət kəsb edir və daim diqqət mərkəzində saxlanılır. Bu sahədə fəaliyyətin təkmilləşdirilməsi, dövlət orqanlarının informasiya resursları və sistemlərinin mümkün təhdidlərdən qorunması, kibertəhlükəsizlik üzrə ümummilli hazırlığın və maarifləndirmənin yüksəldilməsi məqsədi ilə ölkədə Azərbaycan Respublikası Xüsusi Dövlət Mühafizə Xidmətinin Xüsusi Rabitə və İnformasiya Təhlükəsizliyi Dövlət Agentliyi və Azərbaycan Respublikasının Rabitə və Yüksək Texnologiyalar Nazirliyi yanında

(Davamı 6-cı səhifədə)

# Azərbaycan Respublikasında informasiya cəmiyyətinin inkişafına dair 2014-2020-ci illər üçün MİLLİ STRATEGİYA

(Əvvəli 5-ci səhifədə)

Elektron Təhlükəsizlik Mərkəzi fəaliyyət göstərməkdədir.

Görülən işlərin davamlılığının təmin edilməsi və milli potensialın gücləndirilməsi üçün İKT sahəsi üzrə yüksəkixtisaslı kadr hazırlığı genişlənir. Azərbaycan Respublikası Prezidentinin 2007-ci il 16 aprel tarixli 2090 nömrəli Sərəncamı ilə təsdiq edilmiş "2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı"nda İKT sahəsində yüksəkixtisaslı kadrların hazırlanması prioritet istiqamət hesab edilmişdir. Azərbaycan Respublikasının Rabitə və Yüksək Texnologiyalar Nazirliyinin nəzdində fəaliyyət göstərən İnsan Resurslarının İnkişafı Fondu vasitəsilə də İKT üzrə mütəxəssislərin hazırlığına dəstək verilir.

Ölkədə rəqabətədavamlı və yüksək ixrac potensiallı, innovativ İKT sənayesinin inkişaf etdirilməsi məqsədi ilə Azərbaycan Respublikası Prezidentinin müvafiq fərmanları ilə Azərbaycan Respublikasının Rabitə və Yüksək Texnologiyalar Nazirliyinin tabeliyində İnformasiya Texnologiyalarının İnkişafı Dövlət Fondu və "Yüksək Texnologiyalar Parkı" yaradılmışdır. Bu yeni qurumlar Azərbaycan Respublikası iqtisadiyyatının güclənməsinə, xarici investisiyaların cəlb edilməsinə və ölkədə İKT məhsullarının istehsalının genişlənməsinə, yeni yaranan şirkətlərin fəaliyyətinin təşkilinə və innovativ təşəbbüslərə ("start-up"lara) maliyyə dəstəyini və təşkilati dəstəyi təmin edəcəklər.

Azərbaycan Respublikası bir çox regional layihələrin təşəbbüskarı və aktiv icraçısıdır. BMT Baş Assambleyasının qətnamələri (2009, 2012 və 2013-cü illərdə) ilə dəstəklənən "Trans-Avrasiya Super İnformasiya Magistralı" (TASİM) layihəsinin reallaşdırılması, həmçinin ölkəmizin iştirak etdiyi "Avropa-Yaxın Şərq informasiya magistralı"nın (Europe-Persia Express Gateway - EPEG) imkanlarından istifadə edilməsi ölkəmizin internetə çıxış potensialının xeyli artmasına səbəb olacaqdır.

İnternetdən geniş istifadə milli kontentin inkişafını şərtləndirmiş, dövlət orqanlarının, çoxsaylı hüquqi və fiziki şəxslərin, ictimai təşkilatların saytları yaradılmışdır. Sosial şəbəkələrdən, digər sosial media vasitələrindən istifadə geniş vüsət almış, ölkəmizin tarixinə, mədəniyyətinə, təhsilinə və digər sosial sahələrinə aid müxtəlif informasiya ehtiyatlarının sayı xeyli artmışdır.

Cəmiyyətdə İKT-nin inkişafından bəhrələnmə imkanının genişləndirilməsi üçün ilk növbədə əhalinin İKT üzrə biliklərinin artırılması, görülən işlər və mövcud imkanlar barədə vətəndaşların məlumatlandırılması, həmçinin informasiyanın əlçatarlığına şərait yaradan ictimai mərkəzlərin fəaliyyəti və güzəştli şərtlərlə kompyuterlərin əldə edilməsi imkanı yaradılmışdır.

Regionlarda müntəzəm olaraq İKT üzrə müxtəlif təlim kursları, seminarlar keçirilir. "Xalq kompyuteri" layihəsi çərçivəsində müəyyən sosial qruplara güzəştli şərtlərlə müxtəlif tipli 22 500 müasir kompyuter verilmişdir.

Əldə olunan nailiyyətlərlə bərabər, ölkəmizdə informasiya cəmiyyəti quruculuğunu sürətləndirməklə İKT sektorunun inkişafına nail olmaq və sektoru ölkə iqtisadiyyatının aparıcı istiqamətlərindən birinə çevirməklə Konsepsiyada müəyyənləşdirilmiş hədəflərə çatmaq üçün müəyyən addımların atılması zəruridir.

Mövcud vəziyyətin təhlili aşağıdakı nəticələrə gəlməyə əsas verir:

* ölkənin davamlı inkişafının təmin edilməsi üçün İKT-nin prioritet sahə kimi inkişafı vacibdir;

* cəmiyyətin İKT-nin məhsul və xidmətlərinə artan tələbatı təmin olunmalıdır;

* iqtisadiyyatın real sektorlarında və bütövlükdə cəmiyyətdə İKT-dən istifadə genişləndirilməlidir;

* İKT sahəsində rəqabətqabiliyyətli, ixracyönlü və innovativ iqtisadi potensial gücləndirilməlidir;

* İKT sahəsinin normativ hüquqi bazası və dövlət tənzimlənməsi təkmilləşdirilməlidir;

* "elektron hökumət"in nüfuz dairəsi genişləndirilməli, göstərilən elektron xidmətlərin keyfiyyəti, əhatə dairəsi artırılmalı və onların tam avtomatlaşdırılmış interaktiv xidmətlər şəklində həyata keçirilməsi təmin edilməlidir;

* dövlət idarəçiliyinin bütün səviyyələrində və yerli özünüidarəetmə orqanlarında İKT-nin tətbiqi genişləndirilməlidir;

* əhalinin müxtəlif qrupları, şəhər və kənd yaşayış məntəqələri, iqtisadiyyatın müxtəlif sahələri arasında İKT-dən istifadədə mövcud fərqlilik aradan qaldırılmalıdır;

* sahənin yüksəkixtisaslı İKT mütəxəssislərinə olan ehtiyacı ödənilməlidir;

* milli-mədəni irsin qorunması, təhsil, səhiyyə, mədəniyyət sahələri üzrə geniş istifadə üçün təyin edilmiş elektron resurslar inkişaf etdirilməlidir;

* informasiya təhlükəsizliyi üzrə ümummilli hazırlığın və maarifləndirmənin səviyyəsi artırılmalıdır;

* ümumi daxili məhsulda İKT-nin payı inkişaf etmiş ölkələr səviyyəsinə çatdırılmalıdır;

* əhalinin, dövlət qulluqçularının və dövlət müəssisələrində çalışan işçilərin İKT üzrə ümumi bilik səviyyəsi artırılmalıdır;

* görülən işlərə ictimai təşkilatların geniş cəlb edilməsi üçün tədbirlər görülməlidir.

**3. Milli Strategiyanın məqsədi və əsas vəzifələri**

3.1. Milli Strategiyanın əsas məqsədi ölkədə informasiya cəmiyyətinin bərqərar olması, onun yaratdığı imkanlardan vətəndaşların, cəmiyyətin, dövlətin inkişafı üçün səmərəli istifadə edilməsi, ölkənin davamlı və dayanıqlı tərəqqisi, İKT-nin dövlət idarəçiliyində hərtərəfli tətbiqi, habelə sosial-iqtisadi və mədəni sahələrin inkişafına təkan verən iqtisadi sektor kimi inkişaf etdirilməsidir. Bu məqsədə çatmaq üçün aşağıdakı məsələlərin həlli vacibdir:

3.1.1. informasiya və telekommunikasiya infrastrukturunun artan tələbatı təmin edəcək səviyyədə müasirləşdirilməsi, keyfiyyətli xidmətlərin təqdim olunması, əhalinin, biznes qurumlarının və ümumilikdə cəmiyyətin informasiya və texnologiyalardan istifadə imkanlarının genişləndirilməsi;

3.1.2. əhaliyə təhsil, səhiyyə, sosial müdafiə və digər sosial sahələr üzrə göstərilən xidmətlərin keyfiyyətinin yüksəldilməsi;

3.1.3. informasiya cəmiyyəti şəraitində effektiv tənzimləmənin həyata keçirilməsi, insan hüquqlarının, xüsusən də hər bir fərdin informasiya əldə etmək və ünsiyyət qurmaq hüquqlarının hərtərəfli və sərbəst təmin edilməsi;

3.1.4. rəqabətədavamlı və ixracyönlü İKT sənayesinin qurulması, İKT-ni geniş tətbiq etməklə, ənənəvi iqtisadiyyatdan yeni tipli iqtisadiyyata - biliklər iqtisadiyyatına keçidin təmin olunması;

3.1.5. "elektron hökumət"in genişləndirilməsi və İKT-nin tətbiqi ilə dövlət idarəçiliyinin səmərəliliyinin artırılması, demokratik prinsiplərin inkişaf etdirilməsi, elektron xidmətlərin yüksək keyfiyyətinə nail olunması;

3.1.6. informasiya cəmiyyəti mühitində xalqın tarixi, ədəbi və mədəni irsinin qorunub saxlanılması və geniş təbliği;

3.1.7. informasiya və telekommunikasiya texnologiyaları sahəsində yüksək səviyyəli elmi və ixtisaslı kadrların hazırlanması;

3.1.8. hər bir vətəndaş üçün İKT üzrə təhsil və təlim almaq imkanı yaratmaqla, informasiya və İKT-dən təhlükəsiz istifadə mədəniyyətinin yüksəldilməsi;

3.1.9. dünya informasiya məkanında Azərbaycan Respublikasının milli maraqlarının qorunması, cəmiyyətdə İKT-dən qanuni və təhlükəsiz istifadə edilməsi, müasir texnologiyalara etimadın yüksəldilməsi məqsədi ilə informasiya təhlükəsizliyi sisteminin inkişaf etdirilməsi;

3.1.10. regional və beynəlxalq informasiya məkanına inteqrasiyanın genişləndirilməsi.

**4. Milli Strategiyanın həyata keçirilməsinin əsas prinsipləri**

4.1. İnformasiya cəmiyyətinin qurulması zamanı milli səviyyədə aşağıdakı prinsiplərə əməl olunmalıdır:

4.1.1. liderlik - dövlət idarəetmə və yerli özünüidarəetmə orqanlarının, təşkilat və müəssisələrinin rəhbərləri İKT-nin inkişafını və geniş tətbiqini öz fəaliyyətləri ilə bilavasitə təmin etməlidirlər;

4.1.2. bərabərlilik - cəmiyyətdəki mövqeyindən və mülkiyyət formasından asılı olmayaraq, prosesin bütün iştirakçılarının maraqları eyni dərəcədə nəzərə alınmalı, sosial ədalət prinsipi gözlənilməlidir;

4.1.3. şəffaflıq və cəlbolunma - həyata keçirilən fəaliyyət barədə ictimaiyyət geniş məlumatlandırılmalı, açıq ictimai müzakirələr təşkil edilməli və qərarların qəbulunda vətəndaşların, ictimai təşkilatların təklifləri nəzərə alınmalıdır;

4.1.4. əməkdaşlıq - həyata keçirilən fəaliyyətdə dövlət, biznes və vətəndaş cəmiyyəti tərəfdaşlığına xüsusi fikir verilməlidir;

4.1.5. maarifləndirmə - informasiya cəmiyyəti quruculuğuna geniş kütlələrin cəlb olunması, cəmiyyətin hər bir üzvünün bu prosesdə fəal iştirakının təmin edilməsi üçün bu texnologiyalara dair bilik və məlumatlar əhatəli şəkildə əhaliyə çatdırılmalıdır;

4.1.6. sosialyönlülük - vətəndaşların sosial maraqlarının qorunması, hüquqlarının təmin olunmasına hərtərəfli şərait yaradılması əsas götürülməlidir;

4.1.7. millilik - ölkədə yaşayan bütün xalqların mənafeyi nəzərə alınmaqla, milli informasiya resurslarının inkişafına, elmi və mədəni irsin müasir texnologiyalar vasitəsilə qorunmasına, yerli İKT sənayesinin inkişafına, yerli istehsalçıların maraqlarına üstünlük verilməlidir;

4.1.8. mərhələlilik - İKT-nin sürətli inkişafını nəzərə alaraq və mövcud imkanlardan səmərəli istifadəni təmin etmək məqsədi ilə fəaliyyət ardıcıl və mərhələlərlə həyata keçirilməli, proqram və layihələr hazırlanarkən prioritetlər, maliyyə və nəticələrin qısa müddətdə əldə edilməsi əsas götürülməlidir;

4.1.9. innovativlik - elmi-texniki tərəqqinin yenilikləri nəzərə alınmalı, müasir elmi tədqiqatların aparılmasına diqqət artırılmalıdır;

4.1.10. beynəlxalq əməkdaşlıq - qlobal informasiya cəmiyyəti quruculuğunda, İKT sahəsi ilə bağlı beynəlxalq layihələrin həyata keçirilməsində ölkəmiz fəal iştirak etməli, ikitərəfli və çoxtərəfli əməkdaşlıq genişləndirilməli, həyata keçirilən fəaliyyətin ümumdünya informasiya cəmiyyətinin inkişafı ilə sıx əlaqəsi təmin olunmalıdır.

**5. İnformasiya cəmiyyətinin formalaşmasında dövlətin rolu**

5.1. İnformasiya cəmiyyətinin qurulmasında dövlət aparıcı rol oynayır və öz fəaliyyətində, əsasən, aşağıdakıları təmin edir:

5.1.1. informasiya cəmiyyətinin inkişafı üzrə əsas tədbirlərin işlənib hazırlanmasını, onların yerinə yetirilməsində biznes və vətəndaş cəmiyyəti ilə tərəfdaşlığı;

5.1.2. ölkənin davamlı və hərtərəfli inkişafına təsir edən və daha çox sosial-siyasi əhəmiyyəti olan fəaliyyətin reallaşdırılması üçün maliyyələşdirmənin təmin edilməsini;

5.1.3. Azərbaycan Respublikasında informasiya cəmiyyətinin inkişafını xarakterizə edən göstəricilərin müəyyənləşdirilməsini;

5.1.4. İKT-nin inkişafı və onlardan istifadə ilə bağlı mövcud qanunvericiliyin inkişaf etdirilməsini və mütəmadi olaraq təkmilləşdirilməsini;

5.1.5. elm, təhsil və mədəniyyətin sürətli inkişafını, elmtutumlu informasiya və telekommunikasiya texnologiyaları məhsullarının yaradılmasını və istehsalı üçün əlverişli şəraitin formalaşdırılmasını;

5.1.6. "elektron hökumət"in inkişafını, dövlət orqanları tərəfindən göstərilən xidmətlərin elektronlaşdırılmasını;

5.1.7. vətəndaşların informasiya əldə etməsi üçün bərabər imkanların və onların münasibliyinin təmin olunmasını;

5.1.8. müəlliflik hüququnun və intellektual mülkiyyətin qorunmasını;

5.1.9. ölkənin informasiya təhlükəsizliyinin təmin edilməsini;

5.1.10. dövlət qulluqçularının və əhalinin kompyuter savadlılığı səviyyəsinin yüksəldilməsini;

5.1.11. dövlətin təhlükəsizliyinin və müdafiə qabiliyyətinin möhkəmləndirilməsində, ictimai asayişin qorunmasında İKT-nin imkanlarından istifadə edilməsini;

5.1.12. qlobal informasiya məkanına inteqrasiya üçün digər dövlətlərlə və beynəlxalq təşkilatlarla qarşılıqlı əlaqələrin genişləndirilməsini.

**6. Milli Strategiyanın əsas istiqamətləri**

6.1. Milli Strategiyanın prioritet istiqamətləri Konsepsiyaya uyğundur və aşağıdakılardan ibarətdir:

6.1.1. İKT infrastrukturu və xidmətləri;

6.1.2. yüksək texnologiyalar sektorunun inkişafı;

6.1.3. yüksək texnologiyaların inkişafı üzrə elmi-texniki potensialın gücləndirilməsi;

6.1.4. "elektron hökumət"in inkişafı;

6.1.5. İKT - cəmiyyətin inkişaf amili kimi;

6.1.6. kadr hazırlığı;

6.1.7. informasiya təhlükəsizliyinin təmin edilməsi;

6.1.8. milli kontentin inkişaf etdirilməsi.

**7. İKT infrastrukturu və xidmətləri**

7.1. İKT infrastrukturuna və xidmətlərinə universal, hər yerdən ədalətli və münasib qiymətlərlə çıxışın təmin edilməsi informasiya cəmiyyətinin əsas məsələlərindən biridir. Yüksəkkeyfiyyətli genişzolaqlı şəbəkə infrastrukturunun qurulması və onun əsasında təhlükəsiz, ucuz, keyfiyyətli İT xidmətlərinin təqdim olunması, əhalinin bu xidmətlərə çıxış imkanlarının yaradılması, cari və gələcək tələbatı nəzərə almaqla, beynəlxalq internet magistrallarına alternativ və təhlükəsiz birləşmələrin təmin olunması, regional data-mərkəzlər şəbəkəsinin genişləndirilməsi, müvafiq sahədə bazarın liberallaşdırılması bu strateji istiqamətin əsas tərkib hissələrindəndir.

7.2. Bu istiqamətin məqsədlərinə çatmaq üçün aşağıdakıların həyata keçirilməsi nəzərdə tutulur:

7.2.1. yerləşdiyi ərazidən asılı olmayaraq bütün əhalini və təşkilatları birləşdirən yüksəksürətli dayanıqlı, təhlükəsiz genişzolaqlı şəbəkənin qurulması və onun əsasında, kənd yaşayış məntəqələri də daxil olmaqla ölkə ərazisində genişzolaqlı, ucuz və keyfiyyətli xidmətlərin göstərilməsi;

7.2.2. Azərbaycan Respublikasının təşəbbüskarı olduğu və iştirak etdiyi regional infrastruktur layihələrinin reallaşdırılmasını sürətləndirməklə, tranzit informasiya dəhlizi imkanlarının genişləndirilməsi, beynəlxalq internet magistrallarına alternativ və yüksəksürətli birləşmələrin təmin edilməsi;

7.2.3. əhalinin rəqəmli TV yayımı ilə tam əhatə olunması;

7.2.4. milli telekommunikasiya peyk xidmətlərinin genişləndirilməsi, ucqar və əhalisi az olan yaşayış məntəqələrinin yüksəksürətli peyk rabitəsi ilə əhatə olunması;

7.2.5. İKT xidmətlərinin istehsalı, rəqabətlilik və açıq bazar prinsipləri əsasında inkişaf etdirilməsi, bu xidmətlərə tələbatın formalaşdırılması;

7.2.6. genişzolaqlı internetin universal xidmətlər siyahısına daxil edilməsi.

(Davamı 7-ci səhifədə)

# Azərbaycan Respublikasında informasiya cəmiyyətinin inkişafına dair 2014-2020-ci illər üçün MİLLİ STRATEGİYA

(Əvvəli 6-cı səhifədə)

**8. Yüksək texnologiyalar sektorunun inkişafı**

8.1. İnformasiya və biliklərə əsaslanan iqtisadiyyatın inkişaf etdirilməsi, rəqabətqabiliyyətli və ixracyönlü yüksək texnologiyalar sektorunun gücləndirilməsi, investisiya cəlbediciliyinin yüksəldilməsi, ölkədə dünya səviyyəsinə uyğun elmtutumlu və yüksək texnoloji məhsulların yaradılması və onların tətbiqini təmin edən innovasiya sisteminin formalaşdırılması bu istiqamətin əsas məqsədlərindəndir.

8.2. Bu istiqamət üzrə aşağıdakıların həyata keçirilməsi nəzərdə tutulur:

8.2.1. innovativ, elmi-texniki fəaliyyətin və modernləşmə proseslərinin dəstəklənməsi, dövlət siyasəti alətlərinin səmərəliliyinin artırılması;

8.2.2. rəqabətqabiliyyətli İKT məhsul və xidmətlərinin, elmtutumlu texnologiyaların və yüksək texnoloji məhsulların istehsalının stimullaşdırılması, bu sahədə azad və şəffaf rəqabət şəraitinin inkişaf etdirilməsi, biznes və investisiya mühitinin cəlbediciliyinin daha da artırılması;

8.2.3. investisiyaların və intellektual mülkiyyətin qorunması üçün qanunvericiliyin təkmilləşdirilməsi;

8.2.4. İKT sənayesinin, məhsul və xidmətlərinin rəqabət və ixrac potensialının artırılmasına və qabaqcıl texnologiyaların idxalının genişləndirilməsinə əlverişli mühit yaradılması məqsədi ilə xüsusi vergi və gömrük rejimlərinin tətbiq olunması;

8.2.5. innovativ sahibkarlığın inkişaf etdirilməsi, yeni innovasiya şirkətlərinin, elmtutumlu və yüksək texnoloji məhsulların yaradılması və onların dünya bazarlarına çıxışına dəstək verən tədbirlərin genişləndirilməsi;

8.2.6. yeni bilik və texnologiyaların işlənilməsi və tətbiqi üçün texnoparkların, biznes inkubatorlarının və digər innovasiya strukturlarının inkişaf etdirilməsi;

8.2.7. yüksək texnologiyaların, o cümlədən kosmik sənaye, biotexnologiya, elektronika, yeni informasiya texnologiyaları, nano və nüvə texnologiyalarının inkişaf etdirilməsi;

8.2.8. Azərbaycan Respublikasının regional informasiya xidmətləri mərkəzinə çevrilməsi və tranzit informasiya xidmətlərinin genişləndirilməsi üçün tədbirlərin həyata keçirilməsi;

8.2.9. biznes sektorunda İKT-nin tətbiqinin genişləndirilməsi və internet iqtisadiyyatının, o cümlədən elektron ticarətin inkişaf etdirilməsi;

8.2.10. informasiya cəmiyyətinin inkişafına yönəldilmiş fundamental və tətbiqi elmi tədqiqatların aparılmasının genişləndirilməsi;

8.2.11. İKT və yüksək texnologiyalar üzrə "start-up" layihələrin dəstəklənməsi.

**9. Yüksək texnologiyalar üzrə elmi-texniki potensialın gücləndirilməsi**

9.1. Yüksək texnologiyalar sektorunun rəqabətqabiliyyətli inkişafı üçün elmi-texniki potensialın gücləndirilməsi, bu sektor ilə elmi tədqiqatlar arasında əlaqənin möhkəmləndirilməsi, dünya təcrübəsindən istifadə etməklə informasiya cəmiyyətinin tələblərinə uyğun yeni bilik və texnologiyaların yaradılması və yayılması bu istiqamətin əsas məqsədlərindəndir.

9.2. Bu istiqamətin məqsədlərinə çatmaq üçün aşağıdakıların həyata keçirilməsi nəzərdə tutulur:

9.2.1. yüksək texnologiyaların inkişafına yönəldilmiş fundamental və tətbiqi, o cümlədən kosmik, bio, nano texnologiyalar, kibertəhlükəsizlik, elektronika və yüksək texnologiyaların digər istiqamətləri üzrə elmi tədqiqatların genişləndirilməsi;

9.2.2. texnoloji inkişaf və modernləşmə üzrə dövlət, elm, təhsil və biznes səylərinin birləşdirilməsi və əlaqələrin gücləndirilməsi, innovativ inkişaf mühitində yeni tərəfdaşlığın formalaşdırılması;

9.2.3. yüksək texnologiyalar sahəsində elmi fəaliyyətin səmərəliliyinin artırılması və özəl sektorda yüksək texnologiyalar üzrə elmi tədqiqatların aparılmasına şəraitin yaradılması və stimullaşdırılması;

9.2.4. yüksək texnologiyaların sosial-iqtisadi inkişafa təsirinin öyrənilməsi və gücləndirilməsi istiqamətində elmi-texniki tədqiqatların aparılması;

9.2.5. elmi tədqiqatların səmərəliliyinin yüksəldilməsi və infrastrukturunun inkişaf etdirilməsində İKT-nin tətbiqinin genişləndirilməsi.

**10. "Elektron hökumət"in inkişafı**

10.1. Dövlət orqanlarında müasir İKT-nin tətbiqi ilə idarəçiliyin metod və mexanizmlərinin təkmilləşdirilməsi, səmərəliliyinin artırılması, hesabatlılığın və şəffaflığın təmin edilməsi, təqdim olunan elektron xidmətlərin keyfiyyətinin və istifadəsinin artırılması, vətəndaşların dövlət idarəçiliyində iştirakı üçün münasib şəraitin yaradılması bu istiqamətin əsas məqsədlərindəndir.

10.2. Bu istiqamətin məqsədlərinə çatmaq üçün aşağıdakıların həyata keçirilməsi nəzərdə tutulur:

10.2.1. "elektron hökumət" infrastrukturu tələbata uyğun inkişaf etdirilməklə dövlət orqanları arasında səmərəli və təhlükəsiz informasiya mübadiləsinin təmin olunması;

10.2.2. dövlət orqanlarında informasiya ehtiyatlarının müəyyənləşdirilmiş tələblərə və standartlara uyğun olaraq elektron formaya keçirilməsi və bunun əsasında "Elektron hökumət" portalı vasitəsilə "bir pəncərə" prinsipi ilə elektron xidmətlərin göstərilməsi;

10.2.3. sosial-iqtisadi inkişafın prioritet sahələrində, o cümlədən kənd təsərrüfatı, sənaye, turizm və digər sahələrdə İKT və elektron hökumət həllərinin tətbiqinin genişləndirilməsi;

10.2.4. dövlət orqanlarında elektron sənəd dövriyyəsinin genişləndirilməsi və sənədlərlə elektron formada işi təmin etmək üçün digər zəruri sistemlərin (arxivləşdirmə, təhlillər, hesabatlar və s.) tətbiqinin təmin edilməsi;

10.2.5. dövlət orqanları tərəfindən göstərilən elektron xidmətlərin keyfiyyətinin artırılması və əhatə dairəsinin genişləndirilməsi;

10.2.6. "Elektron hökumət" portalının inkişaf etdirilməsi, o cümlədən "şəxsi kabinet"in və dövlət orqanlarına vahid müraciət imkanının yaradılması, "mobil hökumət" texnologiyalarının tətbiqi;

10.2.7. yerli icra hakimiyyəti və özünüidarəetmə orqanlarında elektron xidmətlərin təşkili;

10.2.8. elektron xidmətlərin əlçatarlığının artırılması üçün ictimai çıxış məntəqələri şəbəkəsinin genişləndirilməsi;

10.2.9. elektron və mobil imzanın, həmçinin elektron ödənişin tətbiqinin genişləndirilməsi;

10.2.10. vətəndaşların "elektron hökumət" üzrə məlumatlılıq səviyyəsinin yüksəldilməsi;

10.2.11. əhalinin, dövlət qulluqçularının və dövlət müəssisələrində çalışan işçilərin İKT biliklərinin artırılması üçün keçirilən təlimlərin genişləndirilməsi.

**11. İKT - cəmiyyətin inkişaf amili kimi**

11.1. E-təhsil. Təhsilli gənc nəslin yetişdirilməsi, onların müasir texnologiyaların fəal istifadəçiləri, yaradıcıları kimi formalaşması, İKT-nin təhsil prosesinin bütün mərhələlərinə inteqrasiyası ilə informasiya cəmiyyətinin tələblərinə uyğun müasir təhsil sisteminin qurulması, rəqəmli təhsil informasiya ehtiyatlarının yaradılması, müəllimlərin kompyuter biliklərinin artırılması, e-təhsil və distant təhsil sisteminin müasir tələblərə uyğun inkişaf etdirilməsi, xüsusi qayğı tələb olunan sosial qruplar da nəzərə alınmaqla, fasiləsiz təhsil konsepsiyasının formalaşdırılması və inkişaf etdirilməsi bu istiqamətin əsas məqsədlərindəndir.

11.2. Bu istiqamətin məqsədlərinə çatmaq üçün aşağıdakıların həyata keçirilməsi nəzərdə tutulur:

11.2.1. milli təhsil şəbəkəsinin inkişaf etdirilməsi və bütün ümumi təhsil müəssisələrinin etibarlı, təhlükəsiz genişzolaqlı şəbəkəyə qoşulmasının təmin olunması;

11.2.2. təhsilin resurs mərkəzinin və təhsil prosesini dəstəkləyən elektron tədris vasitələrinin inkişaf etdirilməsi;

11.2.3. bütün təhsil pillələri üçün informatikanın tədrisinin keyfiyyətinin artırılması və dərs vəsaitlərinin texnoloji inkişafa uyğun müasirləşdirilməsi;

11.2.4. mərkəzləşdirilmiş virtual tədris platformasının yaradılması və təhsilin idarə olunması sisteminin inkişaf etdirilməsi;

11.2.5. təhsildə İKT-nin səmərəli istifadəsinin təşkili;

11.2.6. İKT-nin tətbiqi ilə yeni təhsil modellərinin, o cümlədən distant təhsilin həyata keçirilməsi;

11.2.7. vahid milli təhsil portalının fəaliyyətinin genişləndirilməsi və elektron resurslarla zənginləşdirilməsi;

11.2.8. İKT sahəsində fasiləsiz professional hazırlıq sisteminin təkmilləşdirilməsi.

11.3. E-səhiyyə. İKT-nin səhiyyədə tətbiqinin genişləndirilməsi, tibb işçilərinin və pasiyentlərin İKT imkanlarından istifadə etməklə ən son tibbi informasiya və məlumatları əldə etmələrinin təmin olunması, hamı üçün vaxtında, əlçatar və effektiv tibbi xidmətin inkişafına töhfə verilməsi bu istiqamətin əsas məqsədlərindəndir.

11.4. Bu istiqamətin məqsədlərinə çatmaq üçün aşağıdakıların həyata keçirilməsi nəzərdə tutulur:

11.4.1. bütün tibbi personalın, tibb müəssisələrinin etibarlı, təhlükəsiz genişzolaqlı şəbəkəyə qoşulmasını təmin edən Milli Səhiyyə şəbəkəsinin yaradılması və inkişaf etdirilməsi;

11.4.2. elektron sağlamlıq kartı sisteminin inkişaf etdirilməsi və bütün yaş qruplarının elektron sağlamlıq kartları ilə təmin olunması;

11.4.3. tibbi informasiya sistemlərinin tətbiqinin genişləndirilməsi və elektron sağlamlıq sistemi ilə əlaqələndirilməsi;

11.4.4. ümumi istifadə üçün tibbi resursların yaradılması;

11.4.5. teleseһiyyənin inkişaf etdirilməsi;

11.4.6. tibb işçilərinin İKT biliklərinin artırılmasının stimullaşdırılması.

11.5. E-vətəndaş. Yaşadığı ərazidən asılı olmayaraq cəmiyyətin bütün üzvlərinin İKT-nin yaratdığı imkanlardan istifadəsinə şəraitin yaradılması, məqsədli təlim proqramları vasitəsilə əhalinin İKT savadlılığının artırılması, vətəndaşların, xüsusilə də aztəminatlı sosial qrupların İKT-dən bəhrələnməsi üçün onlara müasir texnologiyalardan istifadə üzrə bilik və bacarıqların öyrədilməsi bu istiqamətin əsas məqsədlərindəndir.

11.6. Bu istiqamətin məqsədlərinə çatmaq üçün aşağıdakıların həyata keçirilməsi nəzərdə tutulur:

11.6.1. cəmiyyətin bütün üzvləri, xüsusilə də ucqar kənd yaşayış məntəqələrində yaşayan və ya xüsusi tələbləri olan insanların kompyuterdən, internet xidmətlərindən, "E-hökumət" portalından istifadə bacarıqlarının formalaşdırılması və inkişaf etdirilməsi;

11.6.2. kütləvi və məqsədli İKT aksiyaları və təlimlər keçirməklə bütün vətəndaşlar, biznes qurumları və dövlət tərəfindən İKT biliklərinə yiyələnmənin stimullaşdırılması və hər bir fərdin informasiya cəmiyyətinin aktiv qurucusu olması üçün tədbirlər görülməsi;

11.6.3. kiçik və orta sahibkarların biznes proseslərində İKT-ni tətbiq etmələrinə və İKT vasitəsilə üstünlük əldə edilməsinə kömək göstərilməsi;

11.6.4. teleişin tətbiqinin genişləndirilməsi.

**12. Kadr hazırlığı**

12.1. İKT sahəsinin inkişaf hədəfləri nəzərə alınmaqla sektorun tələbatına uyğun təhsilin müxtəlif səviyyələri üzrə yüksəkixtisaslı kadrların hazırlanması bu istiqamətin əsas məqsədlərindəndir.

12.2. Bu istiqamətin məqsədlərinə çatmaq üçün aşağıdakıların həyata keçirilməsi nəzərdə tutulur:

12.2.1. ölkənin milli rəqabət qabiliyyətinin artırılması və İKT sənayesinin ixrac potensialının genişləndirilməsi üçün insan potensialının və ilk növbədə yüksək intellektual əmək bazarının formalaşdırılması;

12.2.2. ali təhsilin, peşə-ixtisas müəssisələrində İKT üzrə ixtisasların, tədris planlarının, mütəxəssis hazırlığı proqramlarının mütəmadi olaraq aktuallaşdırılması və İKT sahəsinin tələblərinə uyğunlaşdırılması;

12.2.3. İKT sektorunun rəqabətədavamlılığını təmin edən məhsul və xidmətlərin yaradılması və istehsalı üzrə kadr hazırlığının gücləndirilməsi;

12.2.4. İKT-nin prioritet istiqamətləri üzrə xarici ölkələrdə kadr hazırlığının davam etdirilməsi;

12.2.5. İKT ixtisasları üzrə tədris kafedralarının texniki bazasının gücləndirilməsi və müasirləşdirilməsi, elektron tədris resurslarının inkişaf etdirilməsi, tələbə və müəllimlərin dünyanın aparıcı elm və təhsil resurslarına çıxışının təmin olunması;

12.2.6. İKT-nin prioritet istiqamətləri üzrə elmi kadr hazırlığının genişləndirilməsi;

12.2.7. beynəlxalq sertifikata malik İKT üzrə mütəxəssislərin hazırlanmasının dəstəklənməsi.

**13. İnformasiya təhlükəsizliyinin təmin edilməsi**

13.1. Ölkənin informasiya məkanının təhlükəsizliyinin təmin olunması, İKT-dən istifadədə inamın artırılması, həmin sahəni tənzimləyən normativ hüquqi bazanın inkişaf etdirilməsi, məlumatlandırma və maarifləndirmənin həyata keçirilməsi bu istiqamətin əsas məqsədlərindəndir.

13.2. Bu istiqamətin məqsədlərinə çatmaq üçün aşağıdakıların həyata keçirilməsi nəzərdə tutulur:

13.2.1. informasiya təhlükəsizliyi sahəsində vahid dövlət siyasətinin, hüquqi bazanın təkmilləşdirilməsi;

13.2.2. ölkənin milli informasiya məkanının və kritik infrastrukturunun, o cümlədən informasiya infrastrukturunun informasiya təhlükəsizliyini təmin edən sistemin inkişaf etdirilməsi;

13.2.3. ölkənin informasiya əlaqələrində xarici ölkələrdən texniki və texnoloji asılılığın azaldılması üzrə tədbirlərin həyata keçirilməsi;

13.2.4. "e-hökumət" infrastrukturunun informasiya təhlükəsizliyinin təmin edilməsi;

13.2.5. elektron təhlükələr barədə ölkə səviyyəsində məlumatlandırmanın həyata keçirilməsi;

13.2.6. kibertəhlükəsizliyin gücləndirilməsi istiqamətində müvafiq texniki və metodiki vasitələrin yaradılması, tövsiyələrin hazırlanması və metodiki dəstəyin göstərilməsi;

13.2.7. uşaqların qanunazidd və təhlükəli kontentdən qorunması üçün "təhlükəsiz internet" mexanizminin işlənilməsi və tətbiqi;

13.2.8. dövlət və qeyri-dövlət informasiya infrastrukturu subyektlərinin kibertəhlükəsizlik üzrə fəaliyyətlərinin əlaqələndirilməsi;

13.2.9. əhalinin, özəl və digər qurumların kibertəhlükəsizlik sahəsində maarifləndirilməsi və informasiya təhlükəsizliyi mədəniyyətinin formalaşdırılması, bu sahədə ixtisaslı kadrların hazırlanması;

13.2.10. ölkənin informasiya təhlükəsizliyi sahəsində beynəlxalq əməkdaşlığın təmin olunması.

**14. Milli kontentin inkişaf etdirilməsi**

14.1. İnformasiya cəmiyyətinin inkişafı şəraitində milli kontentin genişləndirilməsinə, ölkəmizin milli-mədəni irsinin qorunub saxlanılmasına və inkişafına, əhalinin ondan müasir texnologiyalar vasitəsilə istifadəsinə və bilik səviyyəsinin

(Davamı 8-ci səhifədə)

# Azərbaycan Respublikasında informasiya cəmiyyətinin inkişafına dair 2014-2020-ci illər üçün MİLLİ STRATEGİYA

(Əvvəli 7-ci səhifədə)

artırılmasına diqqət yetirilməsi vacibdir. Bu sahədə əsas fəaliyyət istiqamətləri aşağıdakılardır:

14.1.1. milli kontentin zənginləşdirilməsinə xidmət edən internet resurslarının yaradılmasının dəstəklənməsi;

14.1.2. Azərbaycan tarixi, vətənpərvərlik mövzuları, ədəbi və mədəni irs üzrə internet resurslarının (rəqəmli arxivlərin) yaradılması və inkişaf etdirilməsi;

14.1.3. ümumi inkişaf, təhsil, səhiyyə və digər sahələr üzrə internet resurslarının, məlumat-axtarış sistemlərinin inkişaf etdirilməsi;

14.1.4. milli-mədəni nailiyyətlərə, yerli xalqların və milli azlıqların adət-ənənələrinə həsr olunmuş elektron resursların yaradılması və inkişafı;

14.1.5. kitabxana, arxiv və muzeylərdə İKT-nin tətbiqinin, elektron kitabxana şəbəkəsinin genişləndirilməsi;

14.1.6. ödənişsiz istifadə edilə bilən Azərbaycan dilli proqram təminatlarının hazırlanması və geniş istifadəsinin təmin olunması;

14.1.7. gələcək nəsillər naminə mədəni irsin qorunması və rəqəmləşdirmə prosesinin sürətləndirilməsi;

14.1.8. məkan məlumatları infrastrukturunun qurulması, o cümlədən müxtəlif təyinatlı coğrafi informasiya və naviqasiya resurslarının yaradılması;

14.1.9. onlayn medianın inkişaf etdirilməsi, yeni media vasitələrindən səmərəli istifadəyə dair tədbirlərin görülməsi.

**15. Milli Strategiyanın həyata keçirilməsi mexanizmləri**

15.1. Milli Strategiyanın mərhələlərlə (2014-2017, 2018-2020-ci illər) həyata keçirilməsi nəzərdə tutulur. Hər mərhələ qəbul edilən məqsədli dövlət proqramı əsasında yerinə yetirilir. Dövlət proqramlarında nəzərdə tutulmuş tədbirlərin həyata keçirilməsində qanunvericiliklə qadağan olunmayan maliyyə mənbələrindən, o cümlədən beynəlxalq təşkilatların maliyyə dəstəyindən, metodiki, texniki və digər yardımlardan istifadə olunur.

15.2. Milli Strategiyanın icrasını qiymətləndirmək üçün vətəndaş cəmiyyəti institutlarının iştirakı ilə qabaqcıl beynəlxalq metodologiyaya əsaslanan monitorinqlər və ictimai rəy sorğuları keçirilir. Milli Strategiyanın icrası üzrə görülən işlər barədə ictimaiyyətə mütəmadi olaraq ətraflı məlumat verilir.

15.3. Milli Strategiyanın həyata keçirilməsi prosesində dövlət orqanları ilə özəl sektor və vətəndaş cəmiyyəti institutları arasında sıx əməkdaşlıq və əlaqələndirilmiş fəaliyyət təmin edilir, informasiya cəmiyyəti ideyalarının geniş yayılması naminə fəal təbliğat aparılır.

**16. Gözlənilən nəticələr**

16.1. Milli Strategiyanın hədəfləri Konsepsiyaya uyğundur. Milli Strategiyanın həyata keçirilməsindən gözlənilən nəticələr aşağıdakılardan ibarətdir:

16.1.1. cəmiyyətin hərtərəfli inkişafı üçün informasiya cəmiyyətinin yaratdığı bütün imkanlardan bəhrələnməyə əlverişli şərait yaradılacaqdır;

16.1.2. İKT sektorunun əsas göstəriciləri inkişaf etmiş ölkələrin müvafiq göstəriciləri səviyyəsinə çatdırılacaqdır;

16.1.3. İKT istənilən fəaliyyət sahəsinə daha dərindən nüfuz edəcək, cəmiyyətin inkişafındakı rolu əhəmiyyətli dərəcədə yüksələcəkdir;

16.1.4. onlayn media, sosial şəbəkələr və digər yeni media vasitələri gündəlik fəaliyyətin və əlaqələrin həyata keçirilməsində, cəmiyyətin həyatında mühüm yer tutacaqdır;

16.1.5. ölkədə İKT infrastrukturu inkişaf etdiriləcək və əhalinin artan tələbatını qabaqlayaraq müasir texnologiyalardan inkişaf üçün bəhrələnməyə imkan verəcək, bölgələr, sosial qruplar arasında və digər növ "rəqəmli fərqlilik" azaldılacaqdır;

16.1.6. rəqabətədavamlı İKT sənayesi formalaşacaq, ÜDM-də İKT, poçt və informasiya sektorunun payı artırılacaqdır;

16.1.7. internet azadlığı, informasiya əldə etmək kimi universal dəyərlər təmin ediləcək, vətəndaşların hüquq və azadlıqlarının reallaşdırılması üçün müasir texnologiyalar yardımçı olacaqdır;

16.1.8. genişzolaqlı internet xidmətləri universal xidmətlərə aid ediləcək və ölkə ərazisində genişzolaqlı internet xidmətlərinə çoxçeşidli və müasir texnologiyalar əsasında çıxış imkanları genişləndiriləcəkdir;

16.1.9. internet magistrallarına alternativ və yüksəksürətli birləşmələr təmin olunacaq, tranzit informasiya imkanları genişləndirilməklə Azərbaycan Respublikası regionun İKT xidmətləri bazarının aktiv iştirakçısına çevriləcəkdir;

16.1.10. distant təhsil, elektron ticarət, telesəhiyyə və digər müasir xidmət növlərinin geniş tətbiqinə nail olunacaqdır;

16.1.11. kosmik sənaye inkişaf edəcək, yeni telekommunikasiya və aşağı orbitli peyklərin orbitə çıxarılması ilə etibarlı peyk rabitəsi, milli radio və televiziya proqramlarının peykdən paket yayımı təmin ediləcək, ətraf mühitin mühafizəsi, kənd təsərrüfatı, topoqrafiya və kartoqrafiya, eləcə də milli təhlükəsizlik sahəsində fəaliyyətin səmərəliliyi artırılacaqdır;

16.1.12. İKT-nin inkişafı üzrə elmi-texniki potensial, elm və istehsal arasındakı əlaqələr gücləndiriləcək, elmtutumlu məhsulların, informasiya cəmiyyətinin tələblərinə uyğun yeni bilik və yüksək texnologiyaların yaradılması və dünya bazarlarına çıxış imkanları genişləndiriləcəkdir;

16.1.13. dövlət orqanlarında, yerli icra hakimiyyəti və bələdiyyələrdə müasir İKT-nin tətbiqi genişləndiriləcək, effektiv, şəffaf və nəzarət oluna bilən dövlət idarəetməsi və yerli özünüidarəetmə bərqərar olacaq, əhalinin geniş təbəqələrinin idarəetmə prosesində iştirakı həyata keçiriləcək, elektron xidmətlərin keyfiyyəti yüksəldiləcək, bu xidmətlərə mobil rabitə, məlumat köşkləri və digər müasir vasitələrlə çıxış təmin ediləcəkdir;

16.1.14. İKT əsaslı müasir təhsil sistemi inkişaf edəcək, ümumi təhsil müəssisələrinin genişzolaqlı internetlə təmini 100%-ə çatdırılacaqdır;

16.1.15. vətəndaşların elektron sağlamlıq kartı ilə təmin olunma səviyyəsi artırılacaqdır;

16.1.16. İKT sektorunun inkişaf tempinə uyğun kadr hazırlığı sistemi formalaşdırılacaq, sektorun yüksəkixtisaslı mütəxəssislərə olan tələbatı tam ödəniləcəkdir;

16.1.17. ölkənin informasiya təhlükəsizliyi səmərəli qorunacaq, bu sahədə maarifləndirmə işi təkmilləşdiriləcək, informasiya təhlükəsizliyi mədəniyyəti yüksələcəkdir;

16.1.18. Azərbaycan dilinin milli elektron informasiya məkanında istifadəsi, mədəni irsin qorunmasında İKT-nin tətbiqi genişlənəcəkdir;

16.1.19. "AZ" milli domen zonasında fəaliyyət göstərən internet resurslarının sayı artacaqdır.

# DÜNYA GƏNC ALİMLƏRİNİN BEYNƏLXALQ BAKI FORUMU



26-31 may 2014-cü il tarixlərində Bakı şəhərində "Dünya Elmində Yeni Çağırışlar: Gənc Alimlərin Birgə Yanaşmaları" mövzusunda Dünya Gənc Alimlərinin Beynəlxalq Bakı Forumu (Baku World Forum Of Young Scientists "New Challenges In The World Science: Joint Approaches Of Young Scientists") keçirilmişdir. Dünya Gənc Alimlərinin Beynəlxalq Bakı Forumu Gənclər və İdman Nazirliyinin, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA), "EURODOC" Avropanın Gənc Tədqiqatçılar Şurasının, Azərbaycan Gənc Alim, Aspirant və Magistrlar Cəmiyyətinin və UNESCO üzrə Milli Komissiyasının birgə təşkilatçılığı ilə həyata keçirilmişdir. Forumda dünyanın 100-dək ölkəsindən 400-ə yaxın gənc alim iştirak etmişdir. Forumun açılış mərasimi AMEA-da keçirilmişdir.

Forumu AMEA-nın prezidenti, akademik Akif Əlizadə giriş sözü ilə açaraq tədbir iştirakçılarına uğurlar arzulamışdır. Sonra isə Azərbaycan Respublikası Prezidenti Administrasiyasının Humanitar siyasət məsələləri şöbəsinin müdiri Fatma Abdullazadə çıxış edərək Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin forum iştirakçılarına ünvanladığı təbrik məktubunu oxumuşdur. Forumun açılış mərasimində həmçinin Gənclər və İdman Naziri Azad Rəhimov, Azərbaycan Respublikasının UNESCO üzrə Milli Komissiyasının birinci katibi Günay Əfəndiyeva, "EURODOC" Avropanın Gənc Tədqiqatçılar Şurasının rəhbəri Con Pekkok, AMEA-nın Gənc Alim və Mütəxəssislər Şurasının sədri Famin Salmanov, Azərbaycan Gənc Alim, Aspirant və Magistrlər Cəmiyyətinin sədri İlqar Orucov, "EURODOC"un sabiq rəhbəri Slobodan Radiçev çıxış edərək tədbir iştirakçılarına uğurlar arzulamışlar. Forumda Azərbaycan Prezidenti İlham Əliyev "Gənc alimlərin dostu" mükafatı ilə təltif edilmişdir.



Sonrakı günlərdə forum öz işini dəqiq və texniki elmlər, tibb, biologiya və kimya, iqtisadiyyat və sosiologiya, ekologiya və kənd təsərrüfatı, tarix, fəlsəfə və mədəniyyət istiqamətləri üzrə bölmələrdə çıxışlar və müzakirələrlə davam etdirmişdir. Qeyd edək ki, Dünya Gənc Alimlərinin Beynəlxalq Bakı Forumunda ADPU-nu "Türk Araşdırmaları" elmi-tədqiqat laboratoriyasının elmi işçisi Leyla Kərimova təmsil etmişdir. Leyla Kərimova forumda "Səməd Vurğunun Cənubi Azərbaycan nisgili" ("Samad Vurgun's South Azerbaijan langour") adlı məruzə ilə ingilis dilində çıxış etmişdir.

Dünya Gənc Alimlərinin Beynəlxalq Bakı Forumu çərçivəsində dünyanın müxtəlif ölkələrindən olan gənc alimlər müxtəlif müzakirə və polemikalara qatılmış və səmərəli elmi fikir mübadiləsi aparmışlar.

**Leyla FAİQQIZI,**
**AYB-nın və AJB-nın üzvü,**
**Prezident təqaüdçüsü**

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan tarixi kafedrasının dosenti Eldar Hacıyevə atası

**Əli Hacıyevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan dilçiliyi kafedrasının dosenti Vaqif İsrafilova bacısı

**Sevinc Mustafayevanın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Mexanika və molekulyar fizika kafedrasının dosenti Şakir Xəlilova qardaşı

**Fərhad müəllimin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının baş müəllimi İlham Abbasova atası

**Əli Abbasovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: A. Z. İSGƏNDƏROV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyov küçəsi-68, ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 2457
Sayı: 1500
Çapa imzalanıb: 30.06.2014-cü il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompyuter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.